**BBK.5.2**
**A-29**

*Elmi redaktor:* Nail Vəliyev

A-29 **Firudin Ağasıoğlu.** Etrusk-Türk bağı.
Bakı, Qismət, 2011, 180 səh. (şəkilli)

Dünya tarixində sumerlər və basklar kimi qohumu olmayan, bəlkə tapılmayan yalqız xalqlardan biri də etrusklardır. Miladdan öncə I minil boyu yaşamış bu xalqın xeyli yazı örnəkləri qalsa da, dili hələ 2000 il öncə ölü dillər sırasına girmişdir. Son 200 ildəsə minlərlə alim, uzman və həvəskar araşdırıcılar etruskların soykökünü tapmaq üçün etrusk dilini "açmaq" yolunu axtarır.

Türkoloq F. Ağasıoğlunun yazdığı bu kitabda etruskların mənşəyi, tarixi, etnoqrafiyası, mifologiyası və dili haqqında məlumat verilir, etrusk-türk əlaqələrindən geniş, həm də ilk dəfə sistemli şəkildə bəhs olunur. Elmi-populyar üslubda olan bu kitab müəllifin son 30 ildə türkologiya elminə gətirdiyi türk etnosunun Ön Asiyada yaranması baxışı üzərində qurulmuş yeni "Urmu nəzəriyyəsi" əsasında yazılmışdır. Təkcə etruskların deyil, türklərin də mənşəyinə aydınlıq gətirən etrusk-türk əlaqələrinə aid yeni bəlgələr oxucular üçün maraqlı olacaqdır.

A $\frac{0502000000}{M\text{-}085\text{-}85\text{-}2011}$

**ISBN10 9952-8082-2-4**

**ISBN13 978-9952-8082-2-3**

**Başlıqlar**

Önsöz ........................................................................ 4
Giriş ........................................................................ 6

**I Bölüm**. Qaynaqlar ........................................................ 11
Roma tarixində etrusk dönəmi ................................................. 17
Eneydən Romula ............................................................... 17
Romuldan Tarkona ............................................................. 22
Etrusk mifologiyası .......................................................... 28
Etrusk dini .................................................................. 29
Tanrılar ..................................................................... 38
Demonlar ..................................................................... 47
Etrusk kulturu ............................................................... 50
Sosial durum ................................................................. 50
Sənətkarlıq .................................................................. 59
Etrusk dili .................................................................. 71
Etrusk yazı örnəkləri ........................................................ 92

**II Bölüm**. Etruskların soykökü ............................................ 105
Qafqaz (Azərbaycan) - Troya - Etruriya bağları ............................... 121
Etrusk və saqa-qamər əlaqələri ............................................... 135
Koroğlu - Herekle bağı ....................................................... 141
Etrusk dilində türk sözləri .................................................. 153
Lemni yazısı ................................................................. 158
Ədəbiyat ..................................................................... 175

## ÖNSÖZ

Üç minil öncə İtaliyada ortaya çıxıb min il boyu tarixdə dərin iz qoyan etrusk eli artıq iki minildir ki, bizimlə ölmüş dilində danışmaq istəyir, ancaq danışa bilmir, daha doğrusu, onun nə danışdığını biz anlamırıq, sirlərlə dolu bir xalqın tarixi, bu tarixı içində saxlayan söz dağarcığı açıq olsa da, oradan əlimizə keçən sözlərin anlamını anlamırıq. Açılmaz tapmacalarla dolu Dünya tarixində maraqlı olduğu qədər də aktuallığını saxlayan etruskların kimliyi problemi üzərində bir sıra uzman olmayan araşdırıcıların başvuruşu boşa çıxdığı kimi, uzmanların da səyi hələlik nəticə verməmişdir.

Apennin yarımadasında, indiki İtaliyada Roma imperiyasından əvvəl m.ö. I minil boyu yaşayıb Avropa mədəniyətinə önəmli təsiri olan bu xalq etrusk dilində danışırdı. Latınlar onlara *tusk, etrusk,* yunanlar isə *tirsen, tirren* deyirdi. *Tuskan* adı etrusk dönəmində onların məskunlaşdığı tarixi bölgənin, *Tirren* adı isə onların "gəmi oynatdığı" dənizin adına çevrildi. Anadoludan İtaliyaya köçən etrusklar burada öz tarixi rolunu oynayıb səhnədən çıxdılar, daha doğrusu, çıxarıldılar. Özündən sonra mükəmməl suvarma və drenaj sistemi, arxeoloji-etnoqrafik kultur, kurqan basırıqları, şəhərlər, özəl arxitekturalı məbədlər, körpülər, bugün dünya muzeylərinin şedevrləri sayılan gözəl keramik qablar, metalişləmə, zərgərlik nəsnələri, heykəl-rəsm əsərləri, əlifba-yazı kulturu, zəngin mifoloji miras, sikkə kəsmə gələnəyi qoyub səhnədən gedən etrusklar bizim üçün də cavabını tapmaqda çətinlik çəkdiyimiz çoxlu tapmaca atıb tarixin qara dumanına bürünüb cıxmaza getmişlər. Bir nömrəli tapmacanın sualı isə budur: Etrusklar kim idi?

Etrusklardan sonra iki minil gündəmdə qalan bu sualın cavabı hələ ki yoxdur. Cavab tapılsa, o biri sualların cavabı sıralama çözüləcək. Etruskların kimliyi isə etrusk dilindəki

yazıların şifrəsini aça bilən açarın tapılmasından asılıdır. Bu yöndə axtarışın çətinliyilə bağlı vaxtilə etrusk yazılarının oxunmaması anlamında latın dilində «Etruskca oxunmur» (*Hetruscum non ligatur*) deyimi də yaranmışdı.

Bəzi etrusk sözləri latın dilinə, oradan da bir çöx xalqların dilinə keçmişdir. Bu sözlərdə ilkin forma və mənadan uzaqlaşma olsa da, uzmanlar etrusk praformasını tapmaqda çətinlik çəkmirlər. Məsələn, etrusk dilində "maska" anlaminda *pharsu* sözü indi *persona* formasında, etruskcanın *litera* sözündən yaranan *literatura* sözü geniş işlənir. Bugün Avropa xalqlarının dilindəki *klan, sistem*, *seremoniya*, *sisterna* kimi onlarla söz etrusklardan qalmadır.

Antik çağın korifeyləri sırasında etrusk soylu şair Vergili, heykəltəraş Vulka vardır. Bəziləri Pifaqoru da bu sırada verir. Sezar Avqustun etibarlı adamı sayılan görkəmli siyasətçi Qay Tsilniy Mesenat etrusk idi. Vaxtilə etrusk yurdu kimi *Toskan* adlanan bölgənin Florans şəhərindən Mikelancello, Dante və Leonardo da Vinçi çıxmışlar. Avropa renesansı da bu şəhərdən başlanmışdır. Britaniya ensiklopediyasına görə, Napalyon da Toskandan Korsikaya köçmüş bir ailədəndir.

Etrusk dili ilə yanaşı, onların siyasi-etnik tarixi, etnoqrafiyası, dini haqqında indiyəcən söylənən fikirlər gerçəkliyi hələ tam əks etdirmir. Bu baxımdan, etrusklar haqqında aparılan hər bir araşdırma və yazılan kitablar etruskları tanımağa, etrusk problemini çözməyə doğru atılan addımdır. Ümid edirəm, oxuduğunuz bu kitabın da ikinci bölümündə gözdən keçirilən etrusk-türk (saqa-qamər) bağlarına aid yeni bəlgələr prototürklərin ilkin atayurdunun Ön Asiya olduğunu bəlirləyən yeni Urmu teoriyası ilə etruskları tanımaq yoluna işıq tutan yalnız kiçik bir addım kimi qəbul olunacaqdır.

*Xızı, may 2010*

# GİRİŞ

Bugün Avropanın Dünya sivilizasiyasında öndər olması yolunun başlanğıcında önəmli etrusk payı vardır. Yunan və Roma mədəniyyətinin tarixi axarından Avropa uyqarlığı yarandı, vaxtilə Roma uyqarlığı da etruskların kultur alanları üzərində qurulmuşdu. Ən azından, avropalılarin yazı kulturu latın əlifbasına borcludur ki, onun da kökü etrusk əlifbasına dayanır. Etruskların Tarkvini soyunun Romada hakimiyəti (616-510) yüzil sürdü. Roma imperiyasının təməl daşlarının qoyulduğu bu çağda romalılar mənimsədiyi mifoloji tarixlə, dövlətçilik gələnəyilə sonralar Asiya və Avropada tanındı.

Tarixboyu başqa dilli xalqların içində dilini itirərək əriyib yox olan sumer, elam, kassi, maya kimi çoxlu xalqlar olsa da, etruskcadan fərqli olaraq, onlardan qalma yazılar oxunur və orada nə deyildiyini anlamaq olur. Lakin etrusk yazıları oxuna bilsə də, oradakı sözlərdən çoxunun mənası hələlik aydın deyil. Etruskologiyanın əsas problemlərindən biri də onların mənşəyi, soykökü ilə bağlıdır.

Tarixi ədəbiyatda Etruskların İtaliyaya haradan gəlməsi, onların soykökü mövzusu 2500 il bundan öncə gündəmə gəlməsinə baxmayaraq bugünəcən öz həllini tapmamışdır. XIX əsrin sonunda artıq etrusk dili bir çox dünya dillərilə müqayisə edilmiş, lakin qohum dil axtarışı hələlik bir nəticə verməmişdir.

Vergilinin qədim Roma tarixindən bəhs etdiyi «Eneida» əsərində bu şəhərin əsasını qoyan etrüsk soyköklü Romul və Remin troyalı Eneyin törəmələri olduğu bildirilir. Romanın məşhur Qay sülaləsi də özlünü troyalı Eneyin soyuna bağlayırdı. Məşhur Roma imperatoru Qay Yuli Sezar senatda ilk çıxışında «Mən əsilzadəyəm, troyalı Eneyin nəslindənəm» deyərək özünü təqdim etmişdir.

Qədim etrüsk əfsanəsinə görə, Eneyin törəmələri Romul və Rem sahibsiz qaldıqda onları bir dişi börü (qurd) əmizdirir, ölümdən xilas edir. Sonralar bu ekizlər Roma şəhərinin əsasını qoyurlar. Bu baxımdan, etrusklarda da türklərin qayı boyunun, monqolların qıyat soyunun dişi bozqurd əfsanəsinə uyğun mifoloji inanc olmuşdur. Etruskları türklərlə bağlayan başqa bir oxşarlıq eyni əlifbadan, yəni Orxon-Yenisey abidələrinin yazıldığı runik əlifba ilə eyni qaynaqdan olan əlifbadan istifadə etmələridir.

Etrusklara aid əsas bilgiləri yunan-latın dillərində yazılmış tarixi qaynaqlardan əldə etmək olur. Baxmayaraq ki, latınlar dövlətçilik, şəhərsalma gələnəyini, falabaxma üsullarını, bir çöx sənətkarlıq növünü, araba düzəltməyi, üzüm və zeytun bağları salmağı etrusklardan öyrənmişdilər, ancaq latın yazarları yunan filosofları, tarix və ədəbiyat uzmanları haqqında məlumat verdiyi halda, yaxın qonşuları etruskların irəli gələnləri haqqında susurdular. Yunan və etrusk mədəniyəti eyni çağlarda inkişaf etməsinə baxmayaraq, latınlar eyni kökdən olduqları yunanların mifologiyasını, ədəbiyat və incəsənətini daha doğma sayır, bu mədəniyətin təsirinə düşürdülər. Bu səbəbdən etrusk bədii yaradıcılığı, fəlsəfi fikir türləri və etrusk elm adamları haqqında bəlgələr yoxdur.

Tunc çağından dəmir çağına keçid dönəmlərində İtaliyada *Villanova kulturu* adlanan bəsit bir uyqarlıq vardı. O çağlarda burada latın, rutul, umbr, sabin, samnit, falisk və başqa xalqlar yaşayırdı. Villanova kulturunda görünməyən *bukkero* adlanan yeni tipli keramik qabların Çerveteri (Tsere) şəhərində 700-650-ci illərdə ortaya çıxması göstərir ki, bura etruskların ilk yerləşim bölgəsi idi. II minilin sonlarında Kiçik Asıyanın batısından köçərək Apennin yarımadasının quzey-batısında Arno və Tibr çayları arasında Etruriya (Toskana) bölgəsində yerləşən etrusk boyları artıq I minilin başlarından İtaliyanın önəmli xalqlarından birinə çevrilmiş, 8-ci əsrin ortalarından

6-cı əsrə qədər etrusk ekspansiyası ətraf bölgələri və adaları bürümüşdü. Etrusk çağında Toskana əraziləri Massa-Carrara, Lucca, Pistoya, Prato, Firenze (Florensiya), Piza, Livorno, Arezzo (Arestso), Siena, Grosseto adlanan 10 əyalətə bölünmüşdü.




Sumerlər kimi etrusklar da teokratik dövlət qurmuşdu. Bu qurum siyasi birliyi deyil, Etruriyanın mədəni, dini birliyini təmin edirdi. Ona görə də bir-birinin köməyinə gəlməyən etrusk şəhərləri elə bir-birinin ardınca yenildilər. Etrusk varlığı İtaliyada miladdan öncəki minil boyu davam etdi, ancaq bu

varlıq 500 il üzüyuxarı yüksəlişlə, 500 il də üzüaşağı enişlə davam etdi. Etrusklar Yeni eraya latınca danışan bir toplum kimi keçdi, arxada böyük mədəniyyət buraxsa da, öz keçmişini itirdi.

Miladdan öncə III-I əsrlər ertuskların asimilyasiya olunma dönəmidir. Etruskların sonu çatdı, bu acı sonluq İtaliyanın mərkəzində Yuli Sezar və Oktavian Avqust dönəmində tarix yazarlarının gözü önündə baş verdi, ancaq bu acımasız olayı qələmə alan olmadı, oldusa da, it-bata düşdü, gəlib bizlərə çatmadı. Roma imperiyasını yönətən latın siyasi elitası və latın yazarları hər vəchlə etrusk adının tarixdən silinməsinə çalışırdılar. Bu duruma münasibət bildirən Q. Müleşteynin gerçəkliyi yansıtan belə bir deyimi var: *Etruriya Romanın beşiyi, Roma etruskların məzarı oldu.*

Etrusk-türk əlaqəsindən danışmaq üçün türkologiya elmi *Altay teorisinə* istinad edə bilmir, çünki etruskların İtaliyaya Altaydan getməsini ortaya qoya biləcək bəlgələr yoxdur. Bu baxımdan, türklərin Atayurdunu Ön Asiyada sərgiləyən yeni *Urmu teorisi* isə etrusk-türk ilişkilərini tarixi gerçəkliyə dayanan elmi ölçülərlə ortaya çıxara bilir.[1]

Bir gün xocam Bəxtiyar Vahabzadə dedi ki, Almaniyadan qonağım gəlib, səninlə görüşmək istəyir. Xocamgildə görüşdük, qonaq sumer-türk əlaqələrindən yazdığım bir məqaləni 1985-də çevirib bastıran alman yazarı A. Şmide idi. Söhbət sumerlərdən dolanıb etrusklara gələndə o dedi ki, almanlar etrusklara *turx* demişlər. Bu turx sözü o zaman mənə ipucu verdi. O çağdan etrusklarların dilini araşdırmağa başladım, kiçik qeydlər yazdım, bir qismini sonralar "Azər xalqı" kitabında verdim.[2] Əlimdə etrusk yazılarının orijinalı olmadığı üçün bir ara etrusk məsələsini kənara qoysam da, vaxtaşırı bu

---

[1] Urmu teorisi ilk dəfə Türkologiyanın elmi əsasları haqqında yazılmış "9 Bitik" (Azərbaycan türklərinin islamaqədərki tarixi) əsərində verilmişdir.
[2] *Azər xalqı,* 2000.

maraqlı mövzuya qayıtmalı olurdum. Bu baxımdan, əlinizdə olan bu əsər, demək olar ki, 25 ilə yazılıb. Kitabın bu variantı etruskları geniş oxucu kütləsinə tanıtmaq amacı daşıdığından elmi qaynaqlarla verilən təhlillər imkan daxilində azaldılmış, elmi-populyar üsluba önəm verilmişdir.

Etrusk yazıları üzərində araşdırma bizdə belə bir qənaət yaratdı ki, etrusk dili də çuvaş, hay, alban dili kimi qarışıq dildir. Bu dildəki türkizmlərlə yanaşı başqa bir-iki dilin də izi görünür. Bu izləri leksik qatda aramaq nə qədər asan olsa da, qramatik qatda o qədər çətindir. Etruskologiyanın uğuru isə bu problemin düzgün çözülməsindən asılıdır. Bu baxımdan, etrusk dilini açmaq üçün bir açar yetmir, etrusk dünyasına girmək üçün qapıya iki-üç açarla yaxınlaşmaq gərəkir.

Beləliklə, I bölüm etruskları tanıtma amacı daşıyır, burada onların mifoloji görüşləri, etnoqrafik gələnəkləri haqqında ümumi məlumatlar verilir, etrusk toplumunun sosial durumu tarixi bəlgə və rəsmlərlə şərh edilir, etrusk dilinin əlifbasından, leksik-fonetik və qramatik quruluşudan bəhs olunur.

Kitabın II bölümündəsə etruskların kimliyi haqqında söylənmiş müxtəlif fikirlərin özəti verilir, Bu bölümdə ilk dəfə etrusk və saqa-qamər boylarının əlaqəsi, Goroğlu və Herakl obrazlarının mənşəyi, Lemni yazısının türkcə açımı, Qafqaz, Azərbaycan-Etruriya bağı, etrusk dilində türk sözləri Urmu teorisi işığında tədqiq olunmuşdur.

Beləliklə, türk dili etrusk dilini aça bilən açarlardan biri sayıla bilər, qalır o biri açarların tapılması. Bunun üçün etrusk əlifbasında bir-iki hərfin bildirdiyi səslərə yenidən baxmağa ehtiyac vardır. Uzun və çətin bir yol keçmiş etruskologiya elmi üçün əlifbada kiçik düzəlişlər aparmaq o qədər də çətin olmayacaq. Yetər ki, etrusk əlifbası ilə eyni qaynaqdan olan türk runik əlifbasının özəl orfoqrafik qaydalarından yardımçı vasitə kimi istifadə olunsun.

I BÖLÜM

# QAYNAQLAR

Soyca etrusk olan Tarkvini Prisk m.ö. I əsrdə latıncaya çevrilmiş etrusk qutsal kitablarını toplasa da, onlardan istifadə edən bəzi antik çağ yazarlarının yalnız kiçik qeydləri qalmışdır. İtaliyanın tarixi ilə yaxından ilgilənən imperator Klavdiy soylu etrusk ailəsindən olan xanımı Urqulanillenin aracılığı ilə məşhur etrusk soylarının arxivini əldə etmişdi, lakin onun 20 cilddə yazdığı "Etruskların tarixi" adlı əsəri itmişdir.[3] Etrusk kulturunu yaxşı bilən Klavdiy 48-də bəlli nitqini söyləyir. Tunc lövhə üzərinə yazılmış bu nitq Romanın əfsanəvi hökmdarı Serviy Tulliy haqqında tarixi bəlgə sayılır.

Şotland alimi ser Tomas Dempsterin yazdığı "Çarlıq Etruria haqqında yeddi bitik" (*De Etruria regali libri septem*) adlı çoxcilidli kitab yüzil sonra (1723-1724) Florensiyada çap olunmuşdur. Vaxtilə bəzi yazarların qeyd etdiyi etrusk sözlərini toplayan Aleksandriyalı Hesixin yazdığı qədim sözlükdən də örnəklər verilmiş bu bitik yeni tədqiqatlara, özəlliklə arxeoloji araşdırmalara təkan vermişdi. İki il sonra Toskan elinin mərkəzində yerləşən Kortona şəhərində Korton Etrusk Akademiyası yaradıldı. Artıq 1737-1740-da qısa deyimlə "Etrusk muzeyi" adlanan böyük həcmdə üç tomluq kitab (*Museum Etruskum exhibens insignia veterum Etruscorum Monumenta*) nəşr edildi.

Adolf Dzavaroni etrusk yazılarının hamısını sistemləşdirb internetdə yayımlamışdır. Etrusk yazılarının sayı yeni tapılan yazılarla artmaqda davam edir. 1983-də "Corpus Inscriptio-

---

[3] *Блок*, 2004, 11.

num Etruscorum" adlı topluda verilmiş yazıların bir qismi qüsurlu olduğundan italyan tarixçi-arxeoloqu Massimo Pallottinonun tərtib etdiyi *Testimonia Linguae Etruscae* (TLE) toplusundan istifadə etmək daha faydalıdır.

Etrusk tarixini, mədəniyyətini, dilini öyrənmək üçün baxa biləcəyimiz ən önəmli qaynaq hələlik dili açılmayan etrusk yazılarıdır. Sayı 12 minə çatan bu yazıların içində bir neçə iri həcmli mətnlər olsa da, əksəriyyəti müxtəlif nəsnələr üzərində yazılmış kiçik mətnlərdir.




Bugün Sofiya muzeyində saxlanan altı səhifəlik etrusk bitiyi Bolqariyanın güney-batı bölgəsində qazıntı vaxtı tapılmışdır. Uzmanların m.ö. 600-cü illərə aid etdiyi bu tapıntı ən qədim kitablardan sayılır. Bloknot formalı bitiyin yarpaqları Pirqi yazısının altun lövhəsi kimi altun falqadandır. Döyüşçü, su pərisi, lira və atlı rəsmləri ilə yanaşı bitikdə etrusk dilində mətn var.

Etrusk yazıları içində iyirmidən artıq sözü olanların sayı olduqca azdır, qırxdan artıq sözü olanların sayı isə cəmi səkkiz mətndir. "Corpus İnscriptionum Etruskarum" adlı topluda verilən etrusk yazılarını mövzusuna və həcminə görə belə qruplaşdırmaq olar:

Qablar üzərindəki kiçik yazılar. Adətən belə yazılarda qabın kim tərəfindən hazırlanması və kimin hədiyəsi və ya kimə məxsus olması haqqında bilgi verilrr; Tapınağa və ya müəyən alp-ərənə yönəlik andiçmə və ya yəmin etmə mövzusunda yazılar; Sarkofaq, başdaşı, külqabı üzərində epitafiya xarakterli yazılar; Müəyən şəxslərə həsr olunmuş yazılar;

Əl güzgüsü üzərində çəkilmiş bəlli mifoloji surətlərin adı və bəlli olaylarla bağlı bir neçə sözlü tanıtmalar. Tərkibində nisbətən çox söz olan mətnlər isə bunlardır:



1) Mumiyalanmış bir qadını bürümək üçün istifarə olunan kətan üzərindəki *Liber Linteus* (Kətan bitik) adlanan yazıda 1200-ə yaxın söz vardır;



2) Kapuidən tapılmış V-IV əsrə aid kirəmid üzərindəki 62 sətirlik bustrefedon yazıda 300-ə yaxın oxuna bilən söz vardır;

3) Perucidə II əsrə aid sınır (mərz) daşı sayilan daş lövhə üzərində 130 sözü olan 46 sətirlik yazı;

4) Minerva tapınağına aid V əsr yazısında təxminən yarısı oxunan 80 sözlü 11 sətirlik mətn;

5) 70 sözlü VII əsrin Aribal yazısı;

6) Malyano qəsəbəsində (Toskana) 1883-də tapılan V-IV əsrə aid iki üzü yazılı metal disk üzərində təxminən 70 sözlü yazı;




Malyano qurğuşun lövhəsi, m.ö.V-IV əsr.

7) Pirgi məbədindən tapılan üç qızıl lövhə üzərində törənlə bağlı V əsrə aid yazılar: ikisində 52 söz etrusk hərfləri ilədir, biri isə aramey həflərilə yazılmışdır;




8) Kortonadan tapılmış III-II əsrə aid ikitərəfli tunc lövhə yazısı: bir üzündə 32, o biri üzündə 8 sətir vardır.

Hələlik ortalıqda olan ən qədim etrusk yazıları Kumadan tapılan m.ö. 690-cı illərə aid basırıq epitafiyaları və dini mövzuda qısa yazılardır. Müxtəlif nəsnələr üzərində qısa yazılar sonrakı çağlarda da geniş yayılmışdır və sayı minlərlə olan bu yazılardan bir-ikisini gözdən keçirək.

Tarquinada Şieds basırığındakı freska üzərində yazı:





Şields basırığında freska (m.ö. III əsr)

Buradakı yazının transkripsiyasını M. Copeland belə vermişdir:[4]

**FELeR VR_R AFLE RV FELCHA AP RONAI**

Məncə, yazının transkripsiyası buradakı hərflərə uyğun belə olmalıdır: **velthur davleru (ku)lqa aprthnai** və ya **gelthur dagle thukulqa aprthnai.**

Orvieto basırığında daş üzərində soldan sağa yazılan bu yazı **amar le ana te** şəklində oxunmuş və ona



AMAR LE ANA TE

[4] *Copeland*, 1981.

"*sevimli ananız*" anlamında yozum verilmişdir. Lakin bunun "*Amarle anadır*" bəlgəsi kimi daşa yazıldığını da düşünmək mümkündür.



Bu sarkofaq (daşqutu) üzərindəki yazıda belə sözlər keçir:[5] **LARTH: SENTINATES: CA ESA** Bu yazının oxunuşu "*Lart, sen Tina te(z) kaysa*" ola bilər.




Başqa bir basırıq yazısındasa bəzi etruskoloqlar **AR : CVMNI : AMEI RIAL** sözləri oxumuşlar.[6] Lakin yazıda *Ath, Cumni Amei Thpal* (Topal?) sözləri vardır.

Yunansayağı yapılmış m.ö.VI əsrin sonuna aid bir kasanın alt tərəfində sağdan sola bir yazı vardır: **ITUN TURUCE VENEL ATELINAS TINAS CLINII ARAS.** Bu yazıdakı son sözləri belə də oxumaq olur: ...**TINAS (O)QLINI I ARAS**.

Bu variantda bütöv yazının türkcə deyimi belədir: *"Bu* (qab) *Venel Atelinanın sunağıdır Tinin oğluna 1 (bir) araz".*



Yunansayağı keramik kasa, m.ö.VI əsrin sonu

Başqa bir keramik qab üzərindəki yazı (ETP 110) və onun türkcə anlamı: **ei menepi khape mi · mi : karkus venelus.** *Ey menepi qabı-ım. Mən Karquş Venelu(s).*

[5] **Script LS-1**, photo www.bstorage.com.
[6] **Script AR** (photo courtesy www.bstorage.com).

Beləliklə, etrusk yazılarının müxtəlif nəsnələr üzərində yazıldığını görmək olur. Gündəlik işlənən məişət əşyaları üzərindəki yazılardan tutmuş başdaşı epitafiyalarına qədər müxtəlif məzmunlu mətnlər var. Görünür, o çağlarda keramik qablar üzərində yazı gələnəyi daha geniş yayılıbmış.



Burada verilən bir-iki örnəkdən də göründüyü kimi, etrusk yazılarının oxunuş qaydaları, orfoqrafik özəllikləri hələ tam dəqiqləşməyib. Son bir əsrdə etruskologiya elmi 200-ə qədər etrusk sözünün mənasını və bəzi qramatik göstəriciləri müəyən etsə də, onların nə dərəcədə gerçəkliyi əks etdirdiyini hələlik inamla söyləmək olmur.

Etrusk tarixi, kulturu, dili üzrə elmi araşdırmalar daha çox İtaliya, Almaniya, Avstriya alimləri tərəfindən aparılsa da, bu sahəyə marağın günbəgün artması başqa ölkələrin alimlərini də etrusk tapmacalarına cavab tapmağa yönəltmişdir.[7]

---

[7] Avropada A. Trombetti, A. Pfiffiq, M. Pallottino, M. Alinei, R. Blok, H. Riks, rus alimlərindən A. Nemirovski, A. Kondratov, B. İvanov, A. Xarsekin və başqa alimlərin etruskologiyanın inkişafında önəmli rolu olmuşdur.

# ROMA TARİXİNDƏ ETRUSK DÖNƏMİ

Qədim dünya tarixində Roma imperiyasının önəmli yeri olmuşdur. Roma dövlətinin yaranmasında da Roma şəhərinin və bu şəhəri salan Anadoludan gəlmə boyların önəmli rolu vardı. Həmin boylar etrusk adı ilə tanınsa da, bu ad altında hansı soykökünə, hansı etnosa mənsub boyların olması o qədər də aydın deyil. Olsun ki, Anadoludan İtaliyaya ayrı-ayrı çağlarda müxtəlif soylu boylar köçmüşlər. Qaynaqlar belə köçlərdən ikisi haqqında bilgi verir: Troya savaşından sonra Eneyin başçılığı ilə 12-ci əsrdə və Lidiyadan Tirsenin başçılığı ilə 8-7-ci əsrlərdə. Yunan əlifbasında r/s hərflərinin oxşarlığı nədəniylə *Tirsen* adının bəzi qaynaqlarda *Tirren* kimi verilməsi geniş yayılmışdır. Maraqlıdır ki, etrusklar özlərinə tirren//tirsen deyil, *aras* deyirdilər, aras yurdlarını da *Arasena* adlandırır, *Rasena, Rasna* şəklində yazırdılar.

Etruskların qədim tarixi haqqında bilgi az olsa da, 8-ci əsrdən sonrakı çağlara aid arxeoloji və etnoqrafik bəlgələrdə, yazılı qaynaqlarda onlara aid xeyli məlumat vardır. Təəssüf ki, etruskların öz dilində olan minlərlə yazı hələ də susur və bu durum etrusk tarixinin öyrənilməsinə maneələr yaradır. İtaliyada minil davam edən etrusk tarixinin başlanma çağını bəzi antik cağ yazarları m.ö. 8-ci əsrin ortalarında salınan Roma şəhərinin tarixindən üç əsr əvvələ aid edirlər. Bu da Eneyin başçılığı ilə İtaliyaya olan miqrasiya tarixinə yaxın dönəmdir.

## ENEYDƏN ROMULA

Kiçik Asiyanın quzey-batısında Egey dənizinin yaxasında salınmış qədim Troya şəhərini yunan orduları m.ö. 1200-də dağıtdı. Homerin geniş təsvir etdiyi Troya-Yunan savaşının gerçək tarixə dayanması XIX əsrdən burada aparılan arxeo-

loji qazıntılar da təsdiq etdi. Troyanın yerləşdiyi bölgə İlion adlanırdı. Troya şəhərini salanlar özlərini Zevsin oğlu mifik Dardanın soyundan sayırdılar.

Antik çağ yazarı Apollodora görə, Troya Dardanın nəvəsi Troy tərəfindən salınmışdır. Yunanlarla cavaşda ölən Troyanın son çarı Priamın və bu savaşda ona yardım edən Eneyin soybabaları Dardan idi. Dardan, Troy (Tur), Priam və Eney şəxsadları kimi, Troya ilə bağlı bir sıra toponimlər də türk onomastikasına yad deyildir. Həmin çağlarda batı türklərindən olan subar, ermən, mitan, tiras (tirsa), qaşqay və urmu boylarının, daha əvvəllər dilində xeyli türk sözləri görünən hat boylarının Troya (İlion) ilə əlaqəsini mümkün saysaq, onda belə türkizmlərin gerçək varlığı doğaldır.

Troya şəhəri İdı dağının ətəində yerləşir. Homer Heranın bu dağın zirvələrindən biri olan Qarqar üzərinə qalxmasını yazır.[8] Buradakı *Qarqar, İdı* toponimləri qədim türk *qarqar* boyunun və türk onomastikasında yayğın "qutsal" anlamlı *İdı* dağadı ilə bağlıdır. Güney Azərbaycanda Qarqar bölgəsi, İdı dağadı m.ö. I minilin əvvəllərindən, Quzey Azərbaycanda isə qarqar boyları Alban eli çağından bəlli idi, Qazaxıstanda Qarqar dağı indi də vardır. Bu baxımdan, İtaliyaya köçənlər içində hansısa türk boyunun olması ehtimalı mümkün haldır.

Romulun ulu babası kimi verilən ***Eney*** yunanca *Afrodita*, latınca *Venera* adlanan tanrıcanın oğlu idi. Etrusklarda bu tanrıca ***Turan*** adlanırdı. Yunan mifologiyasına görə dəniz üzərində yığılmış köpükdən doğulan Afrodita gözəllik, sevgi, doğum və məhsuldarlıq tanrıcası sayılırdı. Troya elbəyi Priamın soyundan olan Anxiz ilə Afroditanın izdivacından doğulan Eney Yunan-Troya savaşında Fetida adlı tanrıcanın oğlu, qüdrətli döyüşçü sayılan *Axilə* (Axilles) qarşı təkbətək döyüşə çıxa biləcək yeganə bahadır idi.

---

[8] «*İlliada*», XIV. 292-283.

Savaşda yenilən Troya m.ö. 1200-də yağmalanıb dağıdılmışdı. Hökmdar Priam ailəsilə öldürülmüş, Eneysə arvadını itirmişdi. Salamat qalan troyalıları toplayıb yeni yurd salmaq üçün bir neçə il ətraf ölkələri dolaşan Eney sonra gəmilərlə İtaliyaya keçdi. Burada başçıları Latın adlanan latın boyları yaşayırdı. Eney Latının razılığı ilə o vaxtlar Albula, troyalılar gələndən sonra isə ***Tibr*** adlanan çayın dənizə axdığı bölgədə yurd saldı.[9]

Bu çağlarda latınlar güney qonşuları rutul boyları ilə savaşırdılar və bu savaşlarda yeni gələn troyalılar onlara yardım edirdi. Eney də artıq Latının qızı Lavinia ilə evlənmiş, Latın öləndə onun yerinə keçib latınlarla troyalıların hökmdarı olmuşdu.

Eney öləndə Troyadan onunla gələn oğlu ***Askaniy*** (Askan) başçı olur. Lakin bu dönəmdə Eneyin Laviniadan da bir oğlu olmuş, Lavinia onun adını *Eney Silviy* qoymuşdu. Latınca *silviy* sözü ağacəri boyadında olduğu kimi "ormanlı, meşəli" anlamındadır. 30 il hakimiyətdə olan Askaniy Alba-Lonqa adlı yeni şəhər salıb ora köçür. Askaniy öləndən sonra oğlu *Yul* baş kahin seçilir və bu vəzifə onun soyuna bağlanır, sonrakı baş kahinlər bu soydan olur. Olsun ki, Roma böyükləri içində Yuli (*Yuliy*) soyadı daşıyanlar bu sülalədən idi.

Askaniydən sonra Eney Silviy hakimiyətə keçir və 400 il Silviy sülaləsinin hakimiyəti davam etdir. Romulun anası Reya Silviya da bu soydan idi. Beləliklə, atadan böyük oğula keçən hakimiyətdə bir-birini əvəz edən Silviy soyunun başçıları Amuliyə qədər şəriksiz hakim idi, lakin Amuliy qanuni hökmdar olan böyük qardaşı Numitoru devirib onun taxt-tacına sahib olmuşdu.

---

[9] *Эббот,* 2004, 130; Appian isə çayın əvvəlki adını *Fibr* kimi verir. Belə *Təmir* çay adları türklər olan ərazilərdə genş yayılmışdı.

Hakimiyətə iddia etməsinlər deyə, Amuliy qardaşı oğlunu hiylə ilə ovda öldürdür, qardaşı qızı Reya Silviyanı isə Vesta məbədinə rahibə göndərir ki, ərə gedib uşaq doğmaq imkanı olmasn. Lakin onun bu planı baş tutmur, ərsəyə çatan Reya bir qurdun da göründüyü olayda tanrı Marsa bənzətdiyi birindən hamilə qalıb ekiz oğlan doğur, onlara Rem və Romul adını verir.

Bundan xəbər tutan Amuliy Reyanı zindana, körpələri də Tibr çayına atdırır. Lakin dalğalar ekizlərin qoyulduğu beşiyi sahilə atır və dişi bir qurd onları tapıb əmizdirir.



Sonra uşaqları görən Faustul adlı çoban onları saxlayıb böyüdyr. Ekizlərin kimliyini bilən çoban əsl həqiqəti artıq böyümüş qardaşlara açır. Babaları Numitoru tapıb üsyana hazırlaşan ekizlər Amuliyə qarşı qiyama başçılıq edir və qələbə qazanırlar. Bundan sonra yeni başkənd salmaq istəyən qardaşlar arasında ixtilaf başlayır. Romulun istəyilə qurulan hasarın üstündən hoppanıb keçən Rem "Bax, beləcə asanlıqla düşmənlər sənin tikdiyin divardan keçə biləcəklər" - deyir. Romul da yanındakı fəhlənin əlindən külüngü alaraq Remin başına vurub "Bax, biz də onları beləcə öldürəcəyik" - deyir.

Beləliklə, Romulun qardaş qanı üzərində inşa etdiyi şəhərə Roma adı verildı. Sonralar bu addan romalı anlamında etrusk deyimi *rumaq* (romax) adı yarandı. Qədim dünya tarixinin Roma dönəmi belə başlandı.

Bu hadisələrdən hələ antik çağda müxtəlif tarixçilər azacıq fərqlərlə bəhs etmişlər. II əsr yazarı Aleksandriyalı Appian "Roma tarixi" adlı kitabında Eneydən Romula qədər olan soy ağacı haqqında yazır ki, Troya məğlub olanda qaçıb İtaliyaya sığınan Eney burada hökmdar Favnın qızı Lavinia ilə evlənir,

qaynatası öləndə onun yerinə keçir və üç il sonra tirren boylarından rutullarla müharibədə ölür, Priamın qızı Kreusadan olan oğlu Askaniy onu əvəz edir. Alban dağlarının ətəyində Alba şəhərini salandan sonra Askaniy də ölür, bundan sonra *Silviy* soyadını daşıyanlar (Eney, Latin, Kapis, Kapet, Tiberin, Aqropa, Romil, Aventin və Prok) ata-oğul ardıcıllığı ilə hakimiyətdə olurlar. Bu düzəni Prokun kiçik oğlu Amuliy (*Amul*) pozur, hakimiyəti böyük qardaşı Nemetordan zorla alır, onun oğlu Egesti öldürür, qızı Reya Silvianı isə rahibə edir ki, doğa bilməsin. Lakin Silvia ekiz oğlan doğur. Rem və Pomul adlanan ekizləri Amuliy yaxındakı Tibr çayına atdırır.[10] Sonra uşaqların dişi qurd tərəfindən əmizdirilməsinə aid və Roma şəhərinin salınmasına qədər qısa bilgilər verilir.

Romulun qurduğu plana görə yeni salınmış şəhərdə gənc oğlanlar çox olduğundan qonaqlıq adı ilə buraya qızları ilə gələn ailələr dəvət olunmalı, şənlik vaxtı gənçlər evlənəcəyi qızı seçib qaçırmalı idi. Romadan quzeydə sabini boylarının yurdu idi, başkəndləri Kurı adlanırdı. Qonaqlığa gələnlərin əksəriyəti sabini ailələri olduğundan qaçırılan qızların çoxu onlardan idi.

Tarixçilərin ümumi rəyinə görə Roma şəhəri m.ö.754-753-də salınmışdır, həmin çağlarda bu şəhərin özəyində məskunlaşmanı arxeoloji bəlgələr təsdiq etmişdir. Roma şəhərinin salınması ilə bağlı yaranmış əfsanə mifologiyadan çox etnoqrafik xarakter daşıyır. Belə ki, 8-ci əsrdə yerli latın boyları ilə müxtəlif çağlarda bölgəyə gələn boyların yanaşı yaşaması, bəzilərinin qaynayıb-qarışması, boylar arasında savaş-barış olayları, toplumda formalaşan yeni tipli sosial qurumların oturuşması bu metropolun salınmasından sonra xaotik axardan çıxıb düzənli məcraya düşdü. Artıq bir neçə əsrdən sonra yaranacaq qüdrətli bir imperiya binasının özülü atıldı.

---

[10] *Аппиан,* 2004, 169-171.

Sonrakı 7-6-cı əsrlərdə cəmiyəti və ölkəni inkişafa aparan iqtisadi qalxınma başlanmışdı. Bu çağlarda etrusklar da apardığı aktiv ticarətlə kifayətlənmir, Siciliya, Korsika, Qalliyanın güneyi və hətta İspaniyaya yürüşlər edib oralarda etrusk kaloniyaları salmaq istəyirdilər. Bu isə eyni siyasəti güdən Karfagen kalonistləri ilə qarşıdurma yaradır və bu çağlarda güclənməkdə olan yunanların bu durumdan istifadə etməsinə şərait yaradırdı. Ona görə də artıq Siciliyanı və İtaliyanın güney sahillərini zəbt edən yunanlara geniş ekspansiya üçün yol verməməyə çalışan etrusklar karfagenlilərlə savaşdan əl çəkib müttəfiq olmağa üstünlük verirdilər.

## ROMULDAN TARKONA

Romulun 40 il sürən hökmdarlığı dönəmində bir sıra yeni qayda-qanunlar yarandı. Romulun adına bağlanan bu törəyə görə əhali sosial durumu baxımından iki zümrəyə ayrılırdı: işverən sahibkarlar (*patronlar*) və müxtəlif sahələrdə muzdla işləyənlər *(klientlər*). Hakimiyətdə təmsil olunmaq üçün toplumda hörmət qazanmış yaşlılardan yüz nəfər qocalar məclisi adlanan quruma (*senata*) seçilirdi. Bütün əhali içində aparılan seçki üç hissəyə (üç oq) ayrılan *triblər* üzrə aparılırdı. Romulun ölümü haqqında müxtəlif əfsanələr olsa da, ən geniş yayılan rəvayətə görə, onu tanrılar göyə aparmışlar.

Frezerə görə, Roma şəhərini Alban təpələri yaxasında yerləşən Alba-Lonqa (Uzun Alb) şəhərindən gələnlər salmışdır. Özünü alba-lonqalı sayan Romulun daxil olduğu elbəy süləsi Silviya adlanırdı.[11] Deyilənə görə, Romuldan sonra hakimiyətdə daha altı elbəy olmuşdur. Onların sonuncusu Məğrur Tarkvini də etrusk idi. Tarkvini soyu eyniadlı şəhərdən olub Romanı idarə etmiş, Roma şəhərinin dirçəlib inkişaf etməsi də etruskların 616-dan 509-a qədər davam edən hakimiyəti

---

[11] *Фрэзер*, 1986, 147.

çağlarinda olmuşdur. Roma dövlətçiliyinin əsasını qoyan bu soyun ilk elbəyi etruskların Tarkvini şəhərindən Lutsiy Tarkvini Prisk (616-579) idi, ondan sonra Serviy Tulliy (578-535) və Məğrur Lutsiy Tarkvini (535-509) hakimiyətdə olmuşdur.

Bu sonuncu etrusksoylu II Tarkvini çoxunluğu latınlardan oluşan senatın qərarı ilə Romadan sürgün edilir. Onun hakimiyətə qayıtmasına yardım edən etrusk elbəyi Porsenanın açdığı savaş da nəticəsiz qalır.[12] Beləliklə, Romada etrusk soyunun hakimiyətinə son qoyulur və m.ö.V əsr tiran üsul-idarəsi yaranana qədər davam edən durum artıq hakimiyəti yönətən oliqarxiyanın əl-qolunu açmışdı. Tarkvini soyundan etrusk elbəylərinin bir əsrəcən Roma şəhərində oturması romalıların dövlətçilik gələnəyini mənimsəməsinə təkan vermişdi.

Bəzi qaynaqlara görə, Tarkvini şəhərindən olan bu elbəy soyu guya Korinfdən köçmüş Demaratın oğlu Lukumon ilə bağlıdır. Lukumon arvadı Tanakilin məsləhətilə Roma şəhərinə gəlir. Burada dövlət quşu onun başına qonur, hökmdar seçirlər. Tarkvini Prisk adı ilə bu şəhərdə hökmdarlıq edən Lukumonun devrilməsi haqqında olan rəvayətlərdən birində deyilir ki, etrusk şəhəri Vulçinin elbəyi Qay Viberna etrusk Mastarnanın yardımı ilə Tarkvini Priski devirib yerinə keçir. İmperator Klavdinin etrusksoylu hökmdarlar haqqında Roma senatında 48-ci ildə söylədiyi nitqindəsə Serviy Tullinin elə həmin Mastarna olması qeyd edilir.

Metal yataqlarının bolluğu, metal ticarəti etrusların ekonomik təsir gücünü təkcə İtaliyada deyil, Aralıqdənizının batı yaxalarında da artırmışdı. Bu çağlarda yunan ekspansiyası Apennin yarımadasının sahil boyu güney bölgələrinə, Korsika, Siciliya kimi adalara yetişmişdi. Ticarətdə önə çıxmaq uğrunda etrusk-yunan qarşıdurmalarında yunanlar yendilər.

---

[12] *Plutarx*, 1990, 271-272.

Etrusk-yunan münasibətləri 6-cı əsrin ortalarından başlayaraq barışıq durumunda bir əsr boyunca davam etdi. Etrusk şəhərlərinə gələn yunan tacirləri, sənətkarları bəzi dönəmlərdə burada kolonoya şəklində oturur, emalatxanalar açırdılar. Bu əlaqələr nəticəsində etrusk sözləri yunan dilinə keçdiyi kimi, məişətlə bağlı, özəlliklə keramik qablara aid yunan sözləri də etrusk dilinə keçirdi. Yunan dövləti böyüyərək qüdrətli hərbi-siyasi qüvvəyə çevrildikcə etrusk-yunan münasibətləri pozulmaya doğru gedirdi. Bu çağlarda aktivləşən yunan ekspansiyasına qarşı dənizdə və quruda etruskların dirənişi də artır, yunanlıların çoxu Etruriyadan qovulurdu.

İtaliyaya gedib yerləşdiyi çağlarda etruskların soy-boy bölgüsü ilə yaşadığını düşünmək olar. Etrusk toplumunun yeni yurdda yerləşmə prinsipində, görünür, bu faktor böyük rol oynamışdır, çünki sonrakı dönəmlərdə salınan ayrı-ayrı şəhər və qalalar ətrafında məskunlaşma vahid mərkəzə bağlılıq ilə deyil, kiçuk bölgələr üzrə siyasi-inzibati qurumlarla nəticələnmişdir.

Kiçik bölgəsəl-məhəlli teokratik qurumların konfederativ dövləti kimi görüntüsü olan etrusk siyasi sistemi dini birliyə köklənmişdi. Hər şəhər ətraf kəndlərilə birlikdə bir "dövlət" sayılırdı. Mərkəzi hakimiyəti olmayan belə dərəbəylik qurumlarını yönətən elitaya aid məzarlar açıldıqca klan sisteminin əlamətləri aydın görünür.

Roma şəhərində etrusk kvartalının olması (*Tuskus vikus*) göstərir ki, şəhər sakinlərinin yalnız bir qismi etruskardan, digər qismi isə başqa etnoslardan (latın, sabin və b.) ibarət imiş. Etruriyanın özündə də etrusklar müxtəlif yerli və gəlmə boylarla qarışıq yaşayırdılar.

Etrusk xalqı, etrusk dili deyimlərinin gerçək anlam tutumu o çağların etnik demoqrafiyası, gəlmə və yerli boyların ayrı-

ayrı və ya iç-içə yaşaması ilə bağlıdır. Etnik gələnəklərini saxlayan boyların dini inancları sintezindən yaranmış yeni etrusk dinilə paralel ortaq ünsiyyət vasitəsinə çevrilmiş etrusk dili də Etruriyada yaşayan müxtəlif boyların mədəni birliyi idi. Bu birlik siyasi birliyə, etrusk toplumu da superetnosa çevrilmədi. Bu baxımdan, etrusk dilinə burada yaşayan bir-iki boyun doğma dili, başqa boylarınsa ikinci dili kimi baxmaq gərəkir. XX əsrə qədər Qafqazda azər türkcəsinin rolu nə idisə, etrusk dili də Etruriyada həmin rolu oynamışdır. Lakin vahid etnos olan azər türklərindən fərqli olaraq, etrusklar qarışıq etnos idi və bu durum onların İtaliyada latınlaşmış bir xalq kimi yeni eraya daxil olmasına münbit şərait yaratmışdı.

Sumer xalqı kimi etrusklar da teokratik sistemin hakim olduğu toplumda yaşayırdılar. İnanc sistemi politeizmə köklənmiş hər iki toplumda görünən və görünməyən hər şeyin, xəyal ürünü olan varlıqların da tanrıları olmasına inanırdılar, bu da meydana çoxlu tanrı çıxarmışdı. Hər şəhərin öz himayəçi tanrısı olduğundan həm sumer, həm də etrusk dövlətləri güclü mərkəzə bağlı siyasi rejimə deyil, konfederativ şəhər-dövlət siyasi qurumlarına meyl etmişlər.

Etnoqrafik bəlgələr göstərir ki, etrusk toplumunda iki xətt ön planda olmuşdur. Bunlardan biri kahinlər zümrəsinə olan qabarıq ehtiram, ikincisi də erotik olaylara alışqanlıq. Hətta erotik səhnələrin təsviri basırıq divarlarında çəkilən rəsmlər arasında da vardır. Etrusk toplumunda bir tərəfdə dini törənlərin icra olunduğu məbədlərin, o biri tərəfdə keramik qablar üzərindəki erotik şəkillərin görünməsi, ziddiyətli əxlaq ölçüləri də etruskların qarışıq etnos olmasını ortaya qoyur.

Güman edilir ki, etrusk elbəyləri baş kahin kimi həm dini rəhbər, həm də baş komandan kimi hərbi rəhbər olurdu. Bu isə qədim türk el sisteminə yaxındır. Etrusk elbəylərinə aid

atributları (bənövşəyi xələt, qartalbaşlı əsa və s.) Roma konsulları da qəbul etmişdi. 6-cı əsrin sonunda devrilən Etrusk monarxiyasını respublika qurumu əvəz etdi, lakin dövlət qurumlarında radikal dəyişmə olmadı, yalnız hər il seçilən yeni magistrlər qurumu təsis edildi. Əvvəllər hökmdar titulu sayılan *lukumon* adını daşıyanların artıq siyasi deyil, kahinlik görəvi (*rex sacrificulus*) önə çəkilirdi.

Zəngin filiz yataqları, metalişləmə sahəsindəki gəlişmə, mis, dəmir ticarəti Etruriyanı varlı əyalətə çevirmiş, İtaliya və Aralıqdənizinun batısında nüfuzunu artırıb təsirini gücləndirmişdir. Bu isə VI əsrdə belə hegemonluğa iddiası olan yunanlarla rəqabəti də gücləndirmişdi. Həmin çağlarda eyni durumda olan Karfagen ilə Etruriyanın yunanlara qarşı çıxış etməsi onların müttəfiq olması ilə nəticələnmişdi. Təxminən 540-da baş verən Alalia müharibəsində qalib gələn olmadı, lakin yavaş-yavaş etruskların zəifləmə prosesi başlandı. Bir əsr sonra güneydə təsir dairəsini itirən Etruriya daha bir əsr sonra qall qoşunlarının yürüşü nəticəsində quzey bölgələri, Po çayı vadilərini, Adriatik sahillərini itirdi. Bu çağda etrusk şəhərləri bir-birinin ardınca Romadan asılı duruma düşürdü.

Güney bölgələrini itirən etrusklar və yandaşları Karfagen 480-də Böyük Yunan (Magna Graecia) birliyinə yenildi və bu çağdan Etrusk siyasi-hərbi qüvvəsinin zəifləməsi dönəmi başlandı. Quzeydən III əsrdə Etruriyaya qalların yürüşü isə Po çayının və Adriatik dənizinin yaxalarında da etruskların etgisini azaltdı. Eyni zamanda bir-birinin ardınca Romanın etrusk şəhərlərini 500-cü ildən öz təsir dairəsinə alması artıq etruskların assimilyasiya olunması olayına təkan vermişdi.

İllərlə böyük direniş göstərməsinə baxmayaraq ilk yenilən Veyi şəhəri oldu, 406-da baş verən bu olaydan sonra 395-də Kapena işğala uğradı. Bir əsr sonra müstəqilliyini saxlamış digər etrusk şəhərləri romalılara qarşı birləşsə də, artıq bu ge-

cikmiş bir təşəbbüs idi, 280-dən sonra bütün etrusk bölgələri təpərini artırmış Roma imperiyasının vassalına çevrildi.

Roma gücləndikcə IV əsrdən başlanan bir-birinin ardınca etrusk şəhərlərini özünə tabe etməsi də geniş vüsət alırdı. Bu durumda Veyi kimi bəzi şəhərlər dirəniş göstərsə də, bəziləri dostluq müqavləsi bağlamaqla taleləri ilə barışmaq yolunu tuturdu. Yerli hakimiyət bütöv bölgənin deyil, yalnız özünə aid məhəlli hakimiyəti savunduğundan, dara düşən qonşuya yardım etmədiyindən etrusk şəhərlərini bir-bir ələ keçirmək romalılar üçün yaxşı imkan verirdi. Etrusklar tədricən Roma imperiyası tərkibində latınlaşdılar, artıq I əsrdə etruskca danışıq dili aradan çıxdı. Nə oldu da, dörd əsr İtaliyada hegemon bir xalq olan, şöhrəti ətraf ölkələrə yayılan etrusklar zamanın dumanları içində yox oldu.

Lutsiy Korneliy Sulla etruskları elə zalımlıqla əzmişdi ki, onlarda sonralar üsyan etmə iradəsi qırılmışdı. Bir əsr sonra Avqustun Etruriyaya göndərdiyi yeni kolonistlər dirənişlə qarşılanmadı, latınlaşma olayı aramla, lakin sancısız gercəkləşdi. Eynən bulqarlar kimi: Balkanlara gedən bulqarlar orada dövlət qurdular, bir neçə əsr sonra yerli slavların içində əriyib yox oldular, quruca adları qaldı, bolqar xalqı və Bolqariya.



# ETRUSK MİFOLOGİYASI



Etrusk əfsanəsinə görə, əvvəllər köçəri yaşamla keçinən etrusklar bir gecə ulduzdan qopan işığın yerə düşdüyünü görürlər. Zərbə ilə yerə dəyən işıq parçalanıb kiçik gümüş güzgülərə çevrilir. Etrusklar həmin yeri qazırlar, oradan uşaq görkəmində, lakin saçı ağarmış möcüzəli bir adam çıxır. **Taq** (*Taqes*) adlanan və gələcəkdən xəbər verən bu müdrik etrusklara çox şey öyrədir. İtaliyada ilk sikkələrin basılması da əvəzolunmaz görücü Taqın məsləhətilə gerçəkləşir. Taq çıxan yerdə etruskların Tarkvini adlı şəhəri salınır. Dini və siyasi mərkəzə çevrilən bu şəhər Roma yaranandan sonra ona tabe olur.

Tarixdən bəllidir ki, dəmir çağının başlandığı dövrdə bir çox xalqlarda mifik qəhrəmanlar sırasından peyğəmbər obrazı yaratma meyli artmışdı, özəlliklə m.ö. I minilin ortalarında tanrı və ya tanrılarla insanlar arasında vasitəçi olan belə tanrı elçilərinin həyatı, onların tanrıdan aldığı göstərişlər haqqında kahinlərin söylədiyi dini-didaktik söhbətlər yazıya köçürülürdü.[13] Bu çağda etrusk kahinləri də Taq adlı birindən tanrı elçisi kimi danışır, dini qayda-qanunlar onun adı ilə ayrıca kitaba yazılırdı. Taqın tarixi şıxsiyət olması və ya olmaması isə elmə bəlli deyil.

Etrusk tanrıları ilə görüşüb onlara hədiyələr verən Taq toplumun rifahı üçün çalışır. Digər Tanrı elçiləri kimi müdrik Taq da özünü tanrılaşdırmır, Tanrı ilə toplum arasında vasitəçi rolunu oynayır. Yalnız yeraltı dünyadakı Tuxulxa (Tuqulqa) ilə ölülər diyarının demonu Xaru ona qarşı bəd

[13] *Ağasıoğlu*. Tanrı elçisi İbrahim. 2009, 30.

niyətlərindən əl çəkmirlər, axırda Taqın gördüyü işləri pozmaq üçün hiylə işlədib toplumda mövcud törələrin yadırğanmasına nail olurlar. Taq xalqın başına gələcək bədbəxtlik haqqında yazdığı kitabı bitirib bu dünyanı tərk edir, bununla da etrusk mədəniyətinin süqutu başlanır. Romanın keçmiş durumunu bilənlər deyirmişlər ki, Taqın hara getdiyini və onun yazdığı kitabın harada saxlandığını öyrənmək üçün Xaru insanlara öncə işkəncə verib sonra öldürürmüş. Bəziləri Taqın real tarixi şəxsiyət olduğunu və bu etrusk bilgəsinin sonradan əfsanələşdirilməsi fikrini savunurlar.

## ETRUSK DİNİ

Dənizin, çayın, dağın, bitkinin, ildırımın, tufanın, yelin, yeraltı dünyanın, əcdadların ruhu (qutu) olduğuna inandıqları üçün doğal çevrəni qutsal sayan etrusklar təbii olayları himayə edən tanrı və tanrıcalara tapınırdılar. Etruskoloqlara görə, həmin tanrı və tanrıcalar etusk yazılarında keçən ***ais*** (sonralar ***eis)*** və cəm halda ***aisar*** sözü ilə bildirilir. Bəziləri bunu ***azər*** şəklində oxuyurlar. Maraqlıdır ki, Skandinav saqa (dastan) gələnəyində dövlət quran elbəylərin (konunq) soyu da Troya ilə bağlanır və ***as*** adlı bu soyun tanrıları (*aisar*) da məhz **Azər** ölkəsində yaşayır.[14]

Tit Liviy yazırdı ki, başqa xalqlarla müqayisədə dini törələrinə daha çox önəm verən etrusklardır. Başqa ədəbi-tarixi qaynaqlarda da etrusk toplumunun qatı dindar olmasını əks etdirən bəlgələr vardır. Etrusk dini inamlarında çöxlu tanrılar, yarımtanrılar, demonlar yer tutur. Romalıların inancında yuxarı üçlüyü təşkil edən Yupiter, Yunion və Minerva adlı tanrılar daha öncə Tin, Uni, Menerva adları ilə etrusk panteonunda özünü göstərir. Bəzi məbədlərdə bu üçlüyə aid ayrı mehrablar varmış.

---

[14] *Azər xalqı*, 2005, 15; Məşhur səyyah-alim Thur Heyerdal da qədim azər boyunun və Azər ölkəsinin sorağı ilə Azərbaycana gəlmişdi.

Evrənin (Dünyanın) üçqatlı məbəd kimi yuxarıda Göyə, aşağıda yerüstü və yeraltı bölməyə ayrıldığını düşünən etrusklar hər bölmənin öz tanrısı olduğuna inanırdılar. Bu, vertikal bölgü idi. Horizontal bölgü isə Dünyanın dörd tərəfə ayrılması ilə doğu-batı, quzey-güney cəhətləri bildirirdi. Doğuda xeyirxah, batıda isə şər qüvvələri təmsil edən tanrı və demonlar vardı. Etruskların çoxsaylı panteonu tam aydınlaşmayıb, çünki teonim kimi verilən bəzi adlar əslində epitetlər ola bilər.

Siseron çağında etrusk dini görüşlərinə aid yazılan əsər haqqındakı qeydlər etrusk kosmoqoniyasında göydəki 16 bölmənin hərəsinə aid birər tanrını, zodiakı təmsil edən 12 tanrını, planetlərə aid 7 tanrını və baş tanrı Tinlə bərabər Ana (Uni), Minerva tanrıcalarını, həmçinin tanrılar kurulunu (*senatores deorum*) sərgiləyir.

Etrusk törələri (*disciplina etrusca*) m.ö. II əsrdə qələmə alınmış bir neçə bitikdə əks olunsa da, onlar qalmamışdır, yalnız onlardan bəhs edən bəzi yazarların verdiyi azacıq bəlgələrə əsasən bəlli olur ki, bunlar ildırımlar haqqında (*libri fulgurales*), gələcəkdən xəbərvermə (*libri haruspikini*) və törənlərə (*libri rituales*) aid yazılmış kitablardır. Etrusklar doğal olayları, təbiət hadisələrini ilahiləşdirib çoxlu tanrı və tanrıcalara sitayiş edirdilər.

Başqa bir versiyaya görə, *disiplina etruska* tanrı elçilərinin (peyğəmbərlərin), özəlliklə Taqın yorumlarına köklənən törələrin yazıldığı qutsal bitiklər idi. Belə qutsal bitiklərin sayı isə beş imiş: *libri haruspicini, fulgurales, rituales, fatales, acheruntici.* Birincisi haruspika, ikincisi ildırım yorumları, üçüncüsü icra olunası törənlər, dördüncüsü çeşidli möcüzələr, beşincisi isə ölümdən sonrakı yaşamla bağlı idi. Sadalanan bitiklərdən yalnız ildırım və törənlərə aid olanlar haqqında müəyən məlumatlar bəllidir, digərləri haqqında isə

dolayı tanıtmalar vardır. Belə ki, heyvanın içalatı üzərində falaçma qaydası Pyaçenzada tapılan ciyərformalı tunc fiqur üzərindəki yazı və cizgilərdən bəlli olur.

Rituallar (törənlər) ilə bağlı bitikdə şəhərsalma, məbədlər və mehrab tikmə qaydaları, divara bəzək vurulması, qapının hansı səmtə açılması kimi məsələlər yer tutur. Burada həm də budun, boy, soy bölgüləri, ordunun səfərbərliyi, savaşa hazırlıq, ordunun başında kimin dura biləcəyi, savaş və barış üçün hansı addımların atılması, dini və sivil törənlərin keçirilmə günlərini bildirən təqvim də göstərilmişdir.

Belə törənlərin gerçək üzünü Roma şəhərinin salınması ilə bağlı verilən bilgilərdə görmək olur. Tit Liviy yazır ki, Roma şəhərinin əsası etrusk törəsilə qoyulmuşdur. Belə ki, bu şəhərin Palatin təpəsində əsası qoyularkən onun sınırını cızmaq üçün mərkəzdən eyni məsafə uzantısında dörd daşla bəlirlənmşdir. Ona görə də sonralar *Roma quadrata* (Dördbucaqlı Roma) deyimi yaranmışdı. Şəhərin ilkin qala hasarı həmin kvadrat boyu kotanla açılan şırım üzərində tikilmişdi. Hasarın içindəki İçərişəhərdə yaşamaq hüququ olanlar hasar dışında olanlardan üstün idi. İçəriyə yalnız qapıdan girmək olardı. Etrusk törəsinə görə bu qaydanı pozanı ölüm cəzası gözləyirdi. Romul da həmin törəni pozan qardaşı Remi bu nədənlə öldürmüşdü.

*Libri rituales* bitiyində sosial toplumun yaşam törələri, siyasi-ictimai normalar və obiri dünyadakı durum haqqında bilgi verilirdi. Bu bitiklərlə uğraşan uzman kahinlər iyerarxiyası vardı. Etrusk törələrinin roma toplumuna böyük təsiri olmuşdur. Miladdan sonra, hətta romalılar 408-də qotların Romaya hucumunu etrusk ritualı ilə dəf etmək istəmişdilər.

**İldırım yorumu haqqında bitik.** İldırım çaxmasını yozmaq üçün etrusk kahinlərinə romalıların da vaxtaşırı müraciət etməsi başqa kitablara nisbətən *ildırımla bağlı bitik* haq-

qında daha çox məlumatın qalmasına səbəb olmuşdur. Bu bitikdə ildırım çaxmalarını yozmaq qaydaları, ildırımın hansı tərəfdən çaxması, nəyi vurması və harada eyni olayın təkrar olunması ilə bağlı yozumlar vardı.

Seneka yazır ki, romalılar ildırım çaxmasını buludların toqquşması ilə baş verdiyini düşünür, etrusklar isə ildırımın çaxması üçün buludların toqquşduğunu və bunun tanrıların istəyilə baş tutduğuna inanırdı. Göydən yerə göndərilən 12 türlü ildırımdan baş tanrı Tin yalnız üçünü, tanrılardan bəziləri isə birər ildırım göndərirdi. Ona görə, baxıcılar çaxan ildırımın hansı tanrı tərəfindən, hansı yöndən hansı amacla göndərildiyini öyrənmək üçün fala baxırdılar.

Yandırıb-yaxmaq məqsədilə dağıdıcı ildırımı göndərmək üçün Tin oniki tanrı şurasının razılığını almalı idi. Etrusklar *manubiy* dediyi ildırımlara qorxunc olay kimi deyil, tanrının xəbərdarlığı kimi baxırdılar. İldırımların bir qismi ehtiyatlı olmaqla, bir qismi ölüm və sürgün olayının yaxınlaşması ilə, digəri lukumona (başçıya) qarşı təhlükəli olayla bağlı idi. Baxıcılar gözlənilən bu tür təhlükələrin qarşısını almaq üçün müəyən vaxt ayarlayırdı, bunun icrasının dərhal, yaxud sonraya saxlanması göstərilirdi.

Plini qeyd edirdi ki, deyilənə görə, car Volsini tanrıların qorxunc yaratıq Voltu ildırımla öldürməsinə nail olmuşdur. Bu qeyddən bəlli olur ki, ildırımdan düşməni məhv etmək üçün də istifadə olunmuş, bu məqsədlə ildırımla ilgisi olan tanrılara qurban sunulmuşdur.

**Irq bitik** (fal kitabı). Görünür, Irq bitik yalnız fərdlərin deyil, bütöv toplumun, dövlətin başına gələcəkləri öngörü ilə aydınlığa çıxarmaq amacı güdürdü. Belə fal kitabları Ön Asiyada yayğın idi. Etrusklar insan yaşamını 12 yeddi illiyə ayırır; hər yeddi il dönəmində insan verilən yeni imkanlara uyğun davranmalı, tanrının ona bağışladığını qəbul edərək

tanrıdan yardım diləmək şansını dənəməlidir. Yetmişi bitirən onuncu dönəmdə tanrıdan dilək yolu bağlanır, on ikinci dönəmin sonunda 84-ü haqlayan şəxs öz qutundan (ruhdan) ayrılır, onun ırq bitiyi bağlanır, onun daha işarələrə ehtiyacı olmur.

Etrusk bitiklərindən romalılar da istifadə edirdi. Burada baş verən möcüzələrin yorumu bir növ sorğulara cavab verə bilən mətnlər vardı. Lakin bu bitiklərin itdiyi hallar da bəllidir. Irq bitiklər haqqında romalıların məlumatı olduğundan itmiş bitikləri bərpa etməkdə çətinlik çəkmirdilər. Belə ki, rəvayətə görə, elbəy Tarkvini çağında Romaya gətirilən Irq bitik m.ö. 83-də Kapitolidə baş verən yanğında məhv olsa da, orada yazılanlar bərpa edilmişdir.

Etrusk inancına görə, tanrılar yanlış hərəkət edib günah iş görənləri, tanrılara özəl önəm verməyənləri müxtəlif yollarla fərqli üsullarla cəzalandırır. Bu nədənlə tanrılara qurban sunmaq vazkeçilməz normaya çevrilmişdi. Müxtəlif tanrıların könlünü almaq üçün onların adına məbədlərə verilən ərməğanlar, kəsilən qoyun-quzular haqqında bilgi verən xeyli təsviri sənət əsəri qalmışdır. Ən böyük qurbanlıq isə saqalarda olduğu kimi, insan qurbanı idi. Etrusklar əsasən cinayət etmişlərin və əsirlərin içindən seçilənləri öncə bir-birilə vuruşdurur, məğlub olanı qurban verirdilər. Bu cür vuruşlar sonralar romalılarda qladiator döyüşləri şəklində davam etmişdir.

**Obiri dünya ilə ilgili bitik.** Qutsal yazıların yer aldığı kitablardan biri ölüm və öləndən sönrakı həyat haqqında *ölülər bitiyi* idi. Bu bitikdə yazılanlar haqqında məlumat yalnız etrusk basırıqlarında ortaya çıxan bəlgələrlə bəlli olur. Antik çağ yazarının verdiyi kiçik bir qeyddə də deyilir ki, ölülər bitiyinə əsasən bəzi ölənlərin qutu (ruhu) qutsal sayılması

üçün bəzi tanrılara qurban kəsilən heyvanın qanından istifadə olunurdu.[15]



1

NU TİTE GESİ•GEL•CN CE İP IIII



2

EG TİTE GESİ GE KUZİ THİ AL



3

AL TİTİ GESİ• GEL •KAKE III AL

Görünür, belə qurban vermə törənində tanrıya alqış deyilir, müəyən dualar, nəğmələr musiqilə oxunurmuş. Belə daş qutu basırıqlarında qutsal qut üçün qurbankəsmə törəni 1-cidə iki quzu, 2-cidə bir quzu, 3-cü şəkildəsə qurban veriləcək bir adam (əsir) və törəndə iştirak edənlərin çalıb oynaması təsvir olunmuşdur,

Burada verilən hər daşqutu (sarqofaqın) üzərində sağdan sola yazılmış sözlər sırasında *gesi* sözü çöx guman ki, *kəsmək* feili ilə, *tit* sözü qurban sunulan törənlə, 2-ci yazıda *kuzi* (quzu) sözü elə şəkildəki quzu ilə bağlıdır.

Ola bilər ki, yazılarda verilmiş 3 və 4 rəqəmləri "trio", "kvartet" anlamında musiqi alətində çalanların sayını bildirir.

1. (o)nu tite gesi • gel knke ip IIII
2. eg tite gesi ge(l) kuzi thi al
3. al titi gesi • gel • kake III al

[15] Bu bilgini *Arnobiy* "Adversus nationes"(II.63) əsərində qısa şəkildə qeyd edir.

Bu kiçik yazı örnəkləri aydın göstərir ki, etrusklar ölənin ruhunu qutsallaşdırmaq üçün özəl ritualla yas törəni keçirir, tanrıya quzu qurbanı verirmişlər. Kəsilən quzunun qanını tanrı tapınağına sunmaqla ölənin qutuna obiri dünyada can verib yeni yaşam qazandıracağını düşünürdülər.

**Baxıcılıq.** İldırım çaxması ilə bağlı falabaxma *fulgurales*, baxıcı qam *fulgurator* adlanırdı. Fulgurator ildırımın hansı çağda, hansı istiqamətdə çaxacağı, ildırımı yerə göndərən tanrının məqsəd və istəyini öyrənməli idi. Beləliklə, etrusk fulquratorları falaçma ilə tanrıların niyətini öyrənib ona uyğun önəmli tədbirin alınması üçün məsləhət verir, yol göstərirdilər.



Bu cür baxıcılıq Ön Asiyada geniş yayılmışdı. Kəsilən heyvanın içalatı ilə falabaxma gələnəyi etrusklara hələ Ön Asiyada yaşadıqları çağdan bəlli idi.



Pyaçenzada tapılan m.ö. I əsrə aid ciyər formasındakı falaçma üçün yapılmış tunc fiqur Latın yazarların etrusk mifoloji görüşləri haqqında qeyd etdikləri bəlgələri təsdiq edir. Qoyun ciyərini əks etdirən bu fiqurda Göyün 16 bölməyə ayrılmış hər böl-

məsində tanrı adlarının yazılması etruskların makrokosmos baxışını aydın əks etdirir. Göyün buna bənzər bölgüsü doğu türk şamanizmində görünür. Pyaçenza ciyər nəsnəsi kimi fiqurlar Boğazköy və Babil qazıntılarında da tapılmışdır.

Vulçidən tapılan güzgü arxasındakı şəkildən aydın olur ki, baxıcı fala baxmaq üçün ciyəri sol əlində tutmalı idi. Üzərində yuxarıdan aşağıya baxıcının adı yazılmış güzgüdə soldan sağa **qalqas** (kalkas) sözü aydın oxunur. Qaynaqlara görə, Troya savaşında yunanlıları müşaiyət etmiş axey soylu Kalkas Apollonun tapınağında fala baxan kahin imiş, Kolofonda ölməsi söylənir.[16]



Güzgü.
Vulçi, m.ö. 400
(Vatikan muzeyi)

Haruspik qaydaları və onun yozunu Taqın adına yazılan bitikdə (*Libri Tagetici*) toplanmışdır. Öncə qurbanlıq quzunun kəsilməsi törənlə icra olunur, sonra kəsilmiş quzunun qara ciyəri, ürəyi üzərində baxıcılar tanrının istəyini yozurdu. Quşların uçuşu ilə fal açanlar *avqur* adlanırdılar. Quş uçusu ilə baxıcılıq bəzi türk boyları və hurrilər içində də olmuşdur. Rəvayətə görə, Romulun təşəbbüsülə avqur adlanan üç falçıdan ibarət kahin qrupu yaradılmışdı. Artıq Sezarın vaxtında belə kahin qurumunda 16 üyə avqur vardı.

[16] "XII əsrdə Troyanın süqutundan bir il öncə Amfiloxun müşayiətilə münəccim Mops sonralar Kolofonda ölən axeyli Kalxasla yola çıxmış, Pamfiliyadan keçərək Kilikiyaya gedib orada çar olmuşdu" (*Римшнейдер*, 1977, 17).

Quşların uçuşu və heyvanların içalatı, özəlliklə yeni kəsilmiş heyvanın ciyəri üzərində baxıcılıq etrusk dinigörüşündə öngörü inamına dayanırdı. Belə öngörüdə məqsəd tanrıların müəyən olaya münasibətini öyrənməklə ona uyğun atılacaq addımı uyarlamaq, görüləcək tədbirlər haqqında baxıcıların göstəriş və məsləhətinə əməl etmək idi.



Florensiya Arxeoloji muzeyində saxlanan m.ö.III əsrə aid güzgü (*Torelli*, 1988, 1-ci fiqur)

## TANRILAR

*Etrusk dünyagörüşündə dini baxışlar ilə sosial qurumların arasında bir uyğunluq* vardı. Toplumun müstəqil qərar qəbul edə bilən səlahiyətli vahid hökmdarı olmadığı kimi, etrusk panteonları sistemində də baş tanrı **Tin** yalnız böyük tanrılar şurasına başçılıq edir, önəmli məsələlərin çözümü şura gənəşməsindən keçirdi. Tinə aid məbədlər dolambac cığırlı yolları ilə seçilən



Tin

yüksəkliklərdə salınırdı. Sonralar Tinin mahiyəti romalıların Yupiter tanrısında təcəssüm etmişdir. Etrusların baş tanrısı Tin yunanların Zevsilə müqayisə olunur. Tinin üç növ ildırımı idarə etməsi onun bu tunc fiqurunda əlindıki üçbaşlı şimşək ilə də vurğulanmışdır.



TİN

Tinin tunc fiquru. *(Heidelberg)*

Etrusk panteonları sırasında *Tin* ilə yanaşı *Uni* və *Minerva* adlı tanrıcalar da yüksək yetkili sayılırdı. Göydəki bu üçlük kimi Yeraltı dünyanın da öz tanrıları vardı. Əsas fəaliyəti yeraltı dünyada ölənlərin ruhunu daşımaq olan *Turms,* burada başqan *Aita*, romalıların *Bakx* adlı tanrısının qarşılığı *Fersifay* və müxtəlif demonlar bəllidir.



Tinia sevgilisi tanrıca Talna ilə. (Güzgü, m.ö. IV əsr. Vulçi)

Məbədə qoyulan tanrı bütlərinə buğda, yağ, bal, çaxır, meyvə gətirir, heyvan qurbanı verirdi-

lər. Saqa boylarında olduğu kimi soylu adamların yas törənində hərbi əsirlərdən insan qurbanı da verilirdi və bu, m.ö. II əsrə qədər qladiator döyüşü kimi icra edilirdi. O çağdan isə yas gələnəyindən çıxıb romalıların əyləncə tamaşasına çevrildi.

Yüksək rütbəli çoxsaylı tanrılardan əlavə etrusklar aşağı səviyəli tanrılara, fantastik görünüşü ilə quşlara, heyvanlara bənzəyən varlıqlara itaət edirdilər, qanadlı adam cildindəki bəzi xeyirxah və bədxah demonların varlığına inanırdılar. Məsələn, ailə ocağının hamisi sayılan **Laz** qanadlı gənc qız cildində təsəvvür edilirdi.

Çoxlu məbədləri olan Etruruyada ümumi tanrılarla yanaşı hər bölgənin öz tanrısı da vardı. Tanrılarının çöxluğu həm də qonşu yerli xalqlarla, yunan kaloniyaları ilə əlaqənin nəticəsi kimi mifoloji süjetlərin etrusklara sızması ilə yaranmışdı. Etrusk mifologiyasında yer alan bəzi tanrıadlarını əlifba sırası ilə belə vermək olar:



**AITA.** Yunanların yeraltı Aid və romalıların Plutone tanrısına uyğun gələn *Aita* (*Eita*) etrusklarda obiri dünyanın baş tanrısı sayılır. Qurdbaşlı görünmək üçün başına qurd dərisi geyən Aitin divar rəsmi qalmışdır. Görünür ki, Yeraltı dünyanın simvolu etrusk mifoloji düşüncəsi üçün qurd sayılırmış; **AIVAS.** Güzgü və başqa nəsnələr üzərində adı Eivas, Evas, Eyvaz kimi keçən bu tanrı əsasən yunan mifologiyasında görünür; **ALPAN.** Etrusk təsviri sənətində bu mələyin (Lasa) iştirak etdiyi səhnələr ona böyük önəm verildiyini göstərir; **ANI.** Həm kişi, həm də qadın kimi verilib başlanğıc və Göy tanrısı sayılan Aninin adı **Ana** şəklində də yazılır; **APLU.** Yunan panteonları içində önəmli yeri olan Apollon etrusklarda *Apulu,*

*Aplu* kimi tanınırdı. Uzmanlara görə, insanları qoruyan Aplu əkin və sürülərin də himayəçisi idi. O, hava durumu, işıq və yel tanrısı sayılırdı. Bu tanrının Kiçik Asiya mənşəli olması onun etrusk panteonları sırasına yunanlılardan keçmə deyil, etrusklar Anadoluda ikən mənimsənildiyni ehtimal etmək olar. Homerə görə, Apollon Troyanın hamisi idi; **AGENORA.** Etrusk inancına görə Agenora hər hansı fəaliyətə başlamaq üçün təpər verən, ehtiras yaradan tanrıca idi; **ARTUME.** Gecə və ölüm tanrısı Artumenin adı Artumes, Artimi, Aretume formalarında da yazılır. Bu tanrı təbiətdə iqtisadi artıma təsir edir; **ATUNIS.** Ölüb-dirilmə kultu ilə bağlı olan Adonis finikiyalılarda hər il baharda yenidən doğulurdu, bununla da torpaqda yaşıllıq yaranırdı. Bu kult yunanlara keçdiyi kimi, etrusklarda da Atunis adı ilə yayılmışdı. Təbiətin dirilməsi Atunusin Turanla ər-arvad ilişkisilə gerçəkləşirdi.


Aplunun (Apollon) Veyi məbədi yaxınlığında tapılan heykəli

**BELCANS.** Yanğın tanrısı. Latınların od tanrısı Vulkanın adı Belkan ilə bağlı ola bilər; **BEGOE.** Tanrı elçisi Taq kimi etrusklara törə öyrədir; **EGERIA.** Fontan, şəlalə tanrıcası Egerianın öngörü bacarığı da vardır.



**CALU.** Ölüm tanrısı; **CAUTHNA.** Adətən dənizdən çıxan vəziyyətdə təsvir olunan bu tanrının adı Cath şəklində də yazılır; **CARMENA.** Qarğış tanrıcası; **COMUS.** Şənlik, qonaqlıq, içki tanrısı; **COPIA.** Var-mülk və çoxluq tanrıcası; **CEL.** Yunanların *Qaya* teonimi ilə yaxınlığı qeyd olunur. Bəzən *Ati Cel, Apa Cel* deyimlərilə də işlənir; **CILEN.** Taleh tanrısı; **CULSU, CULSANS.** Qapılar tanrısı; **GIUNONE.** Qısqanclıq və doğum tanrıcası.

**FANA.** Meşə, yer və yabanı heyvanların hamisi olan bu tanrının adı Faunus kimi də qeyd olunur; **FELICITAS.** Uğur tanrıcası; **FORTUNA.** Tale, uğur, qutluq tanrıcası; **FUFLUNS.** Vəzifəsi yunan tanrısı Dionisin görəvlərilə uyğun gələn bu tanrı Tindən sonra ikinci tanrı səviyəsində idi. Yazın gəlişilə təbiətin oyanması, yenidən doğulması və yaşıllıqla bağlı olan Fufluns əkilən bitkiləri kübrə ilə təmin edən, çaxır tanrısı kimi də təqdim edilir; **FURINA.** Qaranlıq və yağmaçılar, talançılar tanrıcası.

**HERKLE.** Su tanrısı Herkle savaş olaylarına da müdaxilə edirdi. Təsviri sənət əsərlərində çox vaxt tanrıca Menerva ilə yanaşı verilən Herkle etrusk toplumunda populyar qəhrəman idi. (Adı müxtəlif formalarda yazılan bu mifik bahadırın türk folklorunda prototipi Goroğlu ilə bağı haqqında II bölmədə geniş məlumat verilir); **HORTA.** Aqrokultur, kənd təssərrüfatı tanrısı.

**LARAN.** Silahlı-yaraqlı bir gənc döyüşçü görkəmilə savaş tanrısı sayılır; **LASA.** Racuneta, Thimnae, Vecu, Sitmica adları ilə birlikdə işlənməsindən də aydın olur ki, *Lasa* adı konkret bir pərinin adı deyil, "pəri" anlamında işlənən ümumi addır. Marisin arvadı da Lasa adlanır. *Alpan, Evan* adlı lasaların şəkilləri əl güzgülərində çox işlənir; **LETHAM.** Hərdən Lethans adı ilə də qeyd olunan yeraltı tanrılardan biri; **LUPERCUS.** Kənd təssərrüfatı hamisi Qurd (Börü) tanrısıdır.



Minerva və Lasa Vecu

**MANIA.** Etruskların Mantua şəhərinin tanrısı sayılır; **MARIS.** Savaş tanrısı *Maris* həm də bitkilərin hamisı sayılırdı. Yunanlarda Ares, romalılarda Mars adlanan bu tanrının Apa Maris (Maris ata) deyimilə işlənməsi də görünür. Maris hər cür konfliktə, savaşa müdaxilə edir, eyni

zamanda gözəl Turanın aşnası sayılır. Maris adına qoşulan Hursnana, Halna, İsminthians, Tiusta adları bu tanrının atributları kimi işlənir; **Menerva.** Müdriklik və incəsənət hamisi Menerva tanrıcaya sonralar Romada *Minerva* adı ilə Kapitoli məbədində tapınmışlar. Müxtəlif qaynaqlarda Menerva savaş, ildırım, balıqçılıq, hava, sağlamlıq, öngörü, müdriklik və sənət (tütək, zurna musiqi alətləri) tanrıcası kimi təqdim olunur. Etrusk yazılarında onun adı *Menrva* kimi oxunur, bizəcə, *Menerva* oxunuşu daha düzgündür. Belə ki, *menerva* şəklində adın yazılışı bu rəsmdə aydın görünür. O, Marsın yanar küpdən çıxmasına yardım etməkdədir. Yuxarıda isə üçbaşlı qurd şəkili verilmişdir; **Mlukukh.** Sevgi tanrıcasıdır; **Munthukh.** Sağlamlıq tanrıcasıdır; **Nethuns.** Su, bulaq, quyu tanrısı sayılan Nethuns lövbər və üçdişli yaba ilə rəsmlərdə təsvir olunur. Romalılar onun adını Neptun formasına saldı; **Nortia.** Uğur, taleh himayəçisi və Yeni il tanrıcası.



**Persipnei.** Yeraltı dünya tanrıcası, Aitin arvadı; **Pertunda.** Eyşişrət və seksual əlaqə tanrıcası; **Rath.** Falabaxma ilə bağlı bir tanrıdır.

**Satur.** Tin kimi ildırımla vura bilən göy tanrılarından biri də Satur idi. Etrusklar bolluq və ümumi bərabərlik dönəmi saydıqları *altun çağı* bu tanrı ilə bağlayır, onu vaxt, zaman tanrısı bilirdilər. Roma panteonları sırasına daxil olan Satur burada Saturn adlandı. Hər il 17 dekabrda keçirilən *Saturnaliy* günü m.ö. III əsrin sonlarından başlayaraq romalıların ulusal bayramına çevrildi; **Selfans.** O biri dünyada yeraltı ocağın (odun) sahibi olan *Selfans* dəmirçi-tanrı sayılırdı. Bəzi uzmanlara



M.ö.V əsr, Pirqi

görə, Populoni şəhərində ona *Velxans* deyirdilər, bu ad *Vulkan* formasında romalılara keçmişdir; **SELVAN.** Bu sınır, bitki, tarla və məhsul tanrısı Selvans Canzata deyimilə də işlənmişdir, Roma çağından isə Silvan obrazında davam etmişdir; **SEMELE** (SEMLA). Ana və uşaq tanrıcası, həm də Atunsun anası sayılır; **SETHCANS.** Sənətkarlıq tanrısı; **SETHLANS.** Od tanrısı; **STRENIA.** Kişiləri daim gərginliyə sürükləyən tanrıca.


Turan. (Tunc heykəl)

**THALNA.** Qanadlı gözəl bir xanım kimi təsvir olunan və uşaqların doğulmasını himayə edən Talna həm də baş tanrı Tinin sevgilisi idi; **THANR.** Adı *Thanur* kimi də yazılan doğum tanrıcası; **TAGNI.** Cadugərlik tanrısı; **TECE.** Adı *Tecum* kimi də yazılan xeyirxahlıq tanrısı, hakim zümrənin, özəlliklə lukumonların himayəçisi sayılır; **THESAN.** Danyeri tanrıcası sayılan Thesan yunanların Eos, romalıların Avrora tanrısına uyğun gəlir; **TELLUS** (TELLIMO). Yerin, Göyün ata-anası sayılır; **TERMINALA.** Sınır, tarla tanrısı, eyni zamanda şəxsi mülkiyətin hamisi; **TURAN.** Məhsuldarlıq tanrısı Turan canlı aləmin hamisi idi. Əgər etruskoloqların dediyi kimi etruskca *tur-* feilinin anlamı "ver-" sözüdürsə, onda ildırım tanrısının aşnası olan gözəlçə Turanın adında verən, bağışlayan anlamı ola bilər. Etrusk yazılarında bir də çoxişlənən *turke* (turuke) sözü vardır. Bu isə tanrıya və ya birinə sunulan *sunaq* nəsnə (qab, heykəl) anlamındadır. Turanın atributu durna quşudur. Bu baxımdan, onun adının *turna* ilə də bağlı olması gerçəkliyə daha yaxındır. Yunanlıların Afrodita, latınların Venera tanrıcasına uyğun olan Turan sevgi və doğumu himayə edir, bəzən Atunus (Adonis) ilə sevişməsi


TURMS, m.ö. 520

qeyd olunur. Gözəl qanadlı gənc qız kimi təsvir olunan bu tanrıca Vulçi şəhərinin tanrısı sayılırdı. Etrusklar Turana hələ Anadoluda ikən tapınırdılar; **Turms.** Ölünü obiri dünyaya aparan Turms (*Turmıs)* yeraltı tanrılardan sayılırdı. Bu tanrıya *Hermu* da deyilirdi ki, bu da onu yunanların Hermes tanrısı ilə yaxınlaşdırır. Bu tanrının Turms və Hermu kimi iki ad daşıması həm də etruskların qarışıq etnos olduğunu göstərir; **Tirrhenus**. Adından da göründüyü kimi, etrusk-ların soybabası Tirren (Tirsen) ilə bağlıdır.

**Uni**. Etrusk şəhərlərinin çoxunda hakimiyyətin hamisi sayılan Uni tanrıcanın tapınağı vardı. Görünür, sonra Roma çağında evlənmə hamisi sayılan Yunon (Yupiterin arvadı) Uni adının dəyişmiş formasıdır. İkidilli Pirgi yazılarından bəlli olur ki, akkadların İştar (sumercə İnanna), fniklərin Astarta tanrıcasının qarşılığıdır; **Usil.** Günəş tanrısı.

**Vanth**. Ölüm cəzası vermək yetgisi olan bu tanrıca qanadlı görkəmi və əlində obiri dünyanın açarı ilə  təsvir olunur; **Veive.** Əlində ox, başında dəfnə çələngilə təsvir olunan bu gənc intiqam tanrısıdır; **Vei.** Kənd təssərrüfatı hamisi sayılsa da, basırıq törəni ilə də əlaqəsi söylənir. Bu tanrıcanın qarşılığı romalılarda Tserera, yunanlarda Demeter sayılır; **Velchans.** Yerə ildırım göndərə bilən bu od tanrısı həm də bitkilərin, yerin hamisidir; **Vesta.** Ocaq tanrıcası; **Voltumna.** Bəzi yazılarda adı Veltha, Velthna, Veltune, Vertumna kimi keçən bu milli tanrı Etruriyada geniş yayılmışdı. Yaşıllıq, bitgi, eyni zamanda etrusk liqasını hamisi və savaş tanrısıdır.

Etrusk yazılarında bəzi teonimlər Ati, Apa sözlərilə birgə işlənir: Cel Ati, Cel Apa. Yazılarda *tanrıoğlu, tanrıoğulları* anlamında Celsclan (Keloğlu), Tinasclenar (Tinoğulları) kimi deyimlər də görünür. Bəzi tanrı adlarının tərkibindəki sözlər türkizm kimi yorumlana bilər, sadəcə, belə elementlərin üzərində ciddi etimoloji araşdırma aparmaq lazımdır.

Qarğış tanrıcası Karmena adındakı *kar* sözü (kar-mena) qarğış sözünün *qar//kar* (qar-ğış) hissəsinə yaxınlığı ilə diqqəti çəkir. Tanışlıqla bağlı etrusk Tana, Tanus tanrıadlarında

tanış, tanımaq sözünün (*tanı-*) kökü, Kulalp, Turms teonimlərində *köl-alp, tur-mış* elementləri, içki tanrısı Komus adında *kumıs* sözü, ocaq tanrıcası Vesta adında *isti* sözü, var-mülk, çoxluq tanrıcası Kopia adında *kop* "çox" sözü, tarla tanrısı Terminala adında *tarım, tarla* sözü görünür. Atributlarından biri *durna* (turna) olan Turan tanrıcanın adında *turna* sözünü aramaq mümkündür. Döğum tanrıcası Thanur, Thanr adının *tanrı* deyimilə yorumu maraqlı ola bilər. Ancaq bu yorumlar üçün ayrıca araşdırma aparmaq lazımdır. Teonim kimi işlənən Ani (Uni), Tarchon (Tarkon), Herkle (Gerokle) kimi bir sıra adların isə türkcə qaynağı bəllidir.

Etrusklarda Günəş tanrısı kimi Usil, Yanus, Giano, Catha, Cavatha, Suri adları, Ay tanrısı kimi Lalal, Tiur, Tiu, adları işlənmişdir. Bunların bir qismi tanrı epiteti, bir qismi də Etruriyanın ayrı-ayrı etnik kökənli boylara aid teonimlər ola bilər. Hər halda, etrusk panteon sistemi nə qədər maraqlıdırsa, o qədər də qarışıq və dolaşıqdır. Etruskoloqlar Aplu, Turan, Aritimi (Artumes), Herkle, Turms, Sethlans kimi bir sıra teonimi Anadolu mənşəli sayırlar.

Beləliklə, yerdəki yaşamda baş verən olayların tanrıların iradəsindən asılı olması, gözdən keçirilən etrusk tanrılarının ayrı-ayrı sahələri himayə etməsi etrusk mifologiyasının ana xəttini təşkil edir. Yuxarıda qeyd olunanlardan başqa, etrusk panteonu sırasında bəzi yazılarda verilən çoxlu teonimlər də vardır.[17] Tanrı və tanrıcalar kimi verilən belə teonimlərdən hansının huri-mələk, iyə, demon, tanrıadı və ya tanrı epiteti kimi işlənməsi o qədər də aydın deyil. Etrusk teonimlərinin bəzi yunan-latın teonimlərinin qarşılığı kimi işlənməsi onla-

---

[17] Anteros, Astrea, Castur, Cath, Cloacina, Corvus, Cul, Culsu, Diana, Esia, Evan, Ethausva, Februus, Feronia, Laruns, Leinth, Letham, Letun, Losna Murcida, Lvsl, Nox, Phersipnai, Pultuce, Picus, Semia, Sime, Summamus, Tecum, Thethlumth, Thufltha, Tiv(r), Tluscva, Tellus, Tellumo, Tecum, Thufulta, Tvath, Vetis, Veive, Velch, Vibrus, Vitumnus, Zirna və sair.

rın semantikasına aydınlıq gətirir. Bəzi teonimlərin isə qarşılığı yoxdur:

| ETRUSK PANTEONLARININ YUNAN-LATIN QARŞILĞI | | |
|---|---|---|
| **ETRUSK** | **ROMA** | **YUNAN** |
| Tin | Jupiter | Zeus |
| Uni, Ani | Juno | Hera |
| Menerva | Minerva | Athena (Afina) |
| Velxans, Sethlans | Vulcanus | Hephaistos |
| Turan | Venus | Aphrodite |
| Maris, Laran | Mars | Ares |
| Turms | Mercurius | Hermes |
| Nethuns | Neptune | Poseidon |
| Fufluns | Bacchus | Dionysos |
| Cel | Tellus (?) | Gaia |
| Selvans | Silvanus | - |
| Usil | Sol | Helios |
| Aplu, Apulu | Apollo | Apollo |
| Aritimi, Artumes | Diana | Artemis |
| Vei | Tserera | Demeter |
| və sairə. | | |

Etruriyanın qürub çağında dini görüşlərdə artıq pessimizm çaları artır. Bununla da təsviri sənətdə ölümlə bağlı Xaru və Tuxulxa kimi demonların müxtəlif nəsnələr üzərində çəkilən şəkilləri artır, bu durum etrusk dönəminin sonunacan beləcə davam edir.

## DEMONLAR

Yeraltı dünya demonlarından Xarontesin vəzifəsi ölənləri obiri dünyaya aparmaqdır. Bu demonun adı daha çox Xaru, Xarun (Karun) şəklində yazılır.



**Xaru.** Ermitaj muzeyində m.ö. IV əsrə aid etrusk qabı üzərindəki şəkildən fraqment.

Elmi ədəbiyatda yazılır ki, son etrusk hökmdarı Məğrur Tarkvini m.ö. 510-da Roma şəhərindən qovulmuşdur. Deyilənə görə, bu olay Xaruya çox ləzzət vermişdir. 452-də Romanı bürüyən və on minlərlə adamın yaşamına son qoyan dəhşətli epidemiyanı da Xarunun ayağına yazırlar. Romada hətta I əsrin əvvəllərinəcən Xarunun qəddarlığını unutmamışdılar. Meydanda yaralanmış qladiatorun canını almaq üçün etrusk demonu maskasında ora çıxarılan cəlladın əlində Xaruya aid balta və dəhşətli səs çıxaran zurna olurdu, elə bir zurna ki Xaru çalanda təkcə adamlar yox, heyvanlar ağlını itirirdi. Meydana belə ovqatla çıxan maskalı cəllad öncə səslə, sonra balta ilə işini görürdü.



Fransua basırığından tapılan freska üzərində Xarunun əlində böyük çəkiç vardır. Ümumiyyətlə, etrusk gələnəyində ölənin alnına kiçik bir çəkiclə toxunmaq adəti vardı və bu ritualı kahinlər də icra edirmiş. Həmin ritual Vatikanda hələ də davam edir, pontifi öləndə kiçik gümüş çəkici onun alnına toxundururlar.

Ölülər diyarında qorxunc demonlardan biri *Tuqulqa* (Tuxulka) adını daşıyır. Bu qorxunc demon əlində ilan yırtıcı quş görkəmində

qanadlı bir yaratıq kimi təsvir olunur. Basırıq rəsmlərinin bəzisində onun şəkili qalmışdır.



Tuqulqa (*Thuxulxa*)



Tuqulqa və Tese (*These*)



Troya olayları etrusk rəsmlərində önəmli yer tutur. Bu divar rəsmində də Axillesen qurbanlıq kimi seçilən troyalı əsirləri öldürməsi səhnəsi əks olunmuşdur. Etrusk demonu Xarunun da bu olayda iştirakı diqqəti çəkir.

Etrusklarda ölən adamın ruhu (qutu) ilə bağlı müəyən inanclar vardı. Yeraltı dünyada kiçik boylu adam fiqurunda təsvir olunan ruhlar bəzən fantastik heyvan (barsla atın qa-

rışığı) və ya at üzərində yüyəni əlində tutmuş qanadlı mələk Vant tərəfindən Ölülər diyarına aparılır. O da Persipnei kimi bu diyarın sahiblərindən sayılır.

Qutun (ruhun) obiri dünyaya aparılması



Kampana basırığı, m.ö.VII əsr



Çerveteri, m.ö. VI əsr

Öləndən sonra insanın başına nə işlər gəlməsi yazılan özəl etrusk kitabları itib-batsa da, vaxtında latın yazarlarının qeydə aldığı bəzi parçalar gəlib bizə çata bilmışdır. Həmin qeydlərdən bəlli olur ki, ölənlər qanadlı tanrıca Vantın sorğu-sualından keçir. Əlində məşəl və obiri dünya qapısının açarını tutan Vant ölənin ruhunu obiri dünyaya yola salır.

Vantdan fərqli olaraq zəhmli demonlardan Xaru əlindəki toxmaqla, qorxunc görkəmli Tuqulqa zəhərli ilanla önlənlərin ruhuna əzab-əziyət verir. Adamlar öləndən sonra onların ruhuna əzab verən bu dəhşətli demonlara bəzi vəhşi heyvanlar da yardım edirdi.



Doğudan gətirilən etrusk dini görüşlərində bəzi türk kurqan gələnəyi ilə uzlaşan elementlər vardır. Kurqan basırığında görünən at şəkili, qoç qurbanı, yemək qalıntıları, qab-qacaq və ölənin qutuna qutsallıq qazandırmaq üçün keçirilən yas törəni etrusklarda təkrar olunur. Lakin etrusk və türk yas gələnəklərinin tam uyğun gəldiyin də söyləmək olmaz, özəlliklə, etrusk basırıq rəsmlərində erotik səhnələr türk əxlaqı, türk törələri dışındadır.

# ETRUSK KULTURU

Etrusk bölgələrində onlardan öncə yaşayan xalqlara aid yazılı bəlgələr yoxdur. Yerli əhalinin özündən sonra buraxdığı azsaylı arxeoloji bəlgələr isə yalnız onların kasıb yaşam ilə keçindiklərini göstərir. Baloniya yaxınlığında Villanovia adlı bölgədə üzə çıxan tunc çağına aid arxeloji bəlgələrə görə "*villanova kulturu*" adlanan çağlarda ölübasdırma adəti görünürsə, sonralar tunc çağının sonları və dəmir çağının başlarında ölüyaxma adəti və yandırılanın külünü saxlamaq üçün fiqurlu küplər, kiçik ev fiqurlu külqabılar ortaya çıxır.

Mifik düşüncə sistemində Ön Asiya gələnəklərini yaşadan etrusklar m.ö. I minilin ortalarında ətraf xalqların kultur gəlişməsinə təsir edə biləcək mədəniyət daşıyıcıları idilər. İtaliyaya yazı kulturunu, yüksək metalişləmə və dulusçuluq sənətini, atçılıq və gəmiçilik gələnəyini gətirən etrusklarm sosial tərkibi, toplumsal biçimləri yerlilərdən fərqlənirdi.

Sosial toplumda hərbi və kahin zümrəsi üstün mövqedə idi. Zadəgan sülalələrinin soyadı əsasən təmsil olunduğu və yiyəsi sayıldığı bölgənin adı ilə adlanırdı. Bu gələnəyi ayrı-ayrı soylara məxsus basırıq türlərində, oradakı epitafiyalarda görmək olur. Etrusk toplumunda kahinlər təbəqəsinə böyük rəğbət vardı.

**Sosial durum.** Basırıqlar varlı-kasıb bölgüsünü aydın əks etdirir. Bəsi basırıqların zənginliyi göstərir ki, burada dəfn olunanların böyük maddi imkanları olmuşdur, əks təqdirdə belə bahalı nəsnələrlə süslənmiş basırıq otaqları yaranmazdı. Buradakı epitafik yazılar da toplumda müəyən vəzifə tutan adamların, onların ailə üzvlərinin dəfn olunduğunu göstərir.

Etrusk şəhərlərinin əsas əhalisi azad əkinçi icmaları, sənətkarlar idi. Qədim türk el (dövlət) qurumunda olduğu kimi Etruriyada da toplumun azad fərdləri, əkinçi, heyvandar və

sənətkar olmasından asılı olmayaraq, müharibələrdə, şəhər, məbəd, kanal, yol və başqa ictimai tikintilərdə iştirak edirdi. Sonrakı Roma və Yunan dövlətlərində olan çoxsaylı qullara nisbətən Etruriyada qul az idi, müharibələrdə əsir düşən və qul bazarlarından alınan kölələr əsasən ev qulluqmusu kimi saxlanır, sahibkarın özəl malı sayılırdı. Kənd təsərrüfatında işləyənlər isə mülkədarlara vergi verən azad insanlar idi.

Etruriya əhalisinin əsas məşğuliyəti əkinçilik idi. Burada susuz torpaqları suvarmaq üçün çoxlu kanallar çəkilir, bataqlıq yerlər də qurudulub əkin üçün yararlı hala salınırdı. Arpa, buğda, darı əkib-biçən etrusklar üzümçülükdə də irəli getmişdilər. Başqa ölkələrə satılan toxuculuq nəsnələri sırasında yun və kətan parçaları olurdu. Kətan parçadan geyim paltarı, gəmilər üçün yelkən hazırlanır, ondan üzərində yazı yazmaq üçün də istifadə olunurdu.

Əkinçiliklə yanaşı burada heyvandarlıq da inkişaf edirdi. İri və xırda buynuzlu heyvanlar saxlayan etruskların içində donuz bəsləyənlər də vardı. Atçılığa önəm verilməsi atların müharibələrdə gərəkli olması ilə bağlı idi.

Romalılar etrusk əlifbasını, elmini və bir sıra kultur sahələri mənimsədiyi kimi, siyasi qurum, dövlətçiliklə bağlı bəzi atributları, terminləri də qəbul etmişlər. Etruskları öz içində əridən bir toplumun onlara ikili münsibəti görünməkdədir: bir yanda etruskların aşağılanması, obiri yanda onlara heyranlıq. Romalılar arasında soykökünün etrusklara bağlanmasından qürur duyanlar da vardı.

Yunanlardan fərqli olaraq, İtaliyada tarixi əsərlərin yazılması m.ö. II əsrdən başlanır. Romada bu janrda ilk əsərini yunanca yazan Fabiy Piktorun ailəsi etrusklarla yaxın əlaqədə idi. Ailə gələnəkləri Romada olduğu kimi, Etruriyada da önəmli sayılır, ailələr arasındakı dostluq əlaqələri nəsil-nəsil ötürülürdü. Bu çağlarda ailə şəcərələrinin yazılması

dəbdə idi. Bu baxımdan məşhur Mesenatın öz soykökü ilə fəxr etməsi, babalarının tanınmış etrusk boyundan olması haqqında evinin girəcəyi üzərində bəlgə yazdırması olayı normal sayılmalıdır. Etrusk epitafiyalarında da ölənin soyu qabarıq verilirdi. Sarkofaqlar üzərində adı keçənlərin içində tarixi şəxslərin adına da rast gəlmək olur. Məsələn, m ö. 44-də Yuliy Sezarı təhlükəli durumdan xəbərdar edən haruspik sarkofaq üzərindəki epitafiyada adı çəkilən *Spurinna* ailəsindən idi.

Küçələri daşla döşənmiş şəhərlərin su şəbəkəsi və çirkli suları kənara axıdan kanalları vardı. Etrusk soylu Tarkvini sülaləsi çağında Roma şəhərinin yerləşdiyi təpələrdən çəkilən belə yeraltı arxlar bugün də kanalizasiya xətləri kimi işləyir. Etrusların saldığı yollar, tikdiyi möhtəşəm körpülər də onların yaşam kulturunda tikintiyə verilən önəmi göstərir.

Etrusk çağında Toskana 10 əyalətə bölünmüşdü: Massa-Carrara, Lucca, Pistoya, Prato, Firenze, Arezzo, Piza, Siena, Livorno, Grosseto.



Mərkəzi konfederasiyaya daxil olan şəhərlərin siyahısı tam olmasa da, antik çağ yazarları onlardan bəzilərinin adını qeyd etmişdir: Arretium (Aresso), Klusium, Kortone, Vulçi, Kaere (Çerveteri), Perusiya (Peruca), Populonia (Pupluna), Ruzellae, Tsere, Veyi, Volaterrae (Volterra), Kyuzi, Vetluna (Vetulonia), Tarquini (Tarkviniya), Volsini və b.




Dördbucaqlı məbədlərini ağaç və kərpiçlə tikən etrusklar tapınaqlara böyük önəm verirdilər. Romalı memar Vitruvinin verdiyi məlumata görə, üçbölümlü məbədlərdə baş tanrı Tin ilə yanaşı tanrıca Uni (Ana) və Minerva üçün də ayrıca bölmələr olurdu. Kahinlərin göydəki durumu izləyə bilməsi üçün məbədlər yüksək yerlərdə tikilirdi.



Etruriyada 12-lik qurumu üç bölgədə - quzey, orta və güney qurşaqda yaranmışdı. Hər yeniyıl günü Volsini (Bolsen) gölünə yaxın Voltumna tanrının tapınağı olan məbəddə toplaşıb bayram şənliyi keçirir, dövlət və dini məsələlərə aid qərarlar qəbul edirdilər. Bu mərasimlər eynən qədim türklərin *toy* (qurultay) törənini xatırladır.

Etruriya vahid dövlət deyil, "12 şəhər dövləti" kimi üç liqada şəhər-dövlətlərin konfederasiyası şəklində mövcud olmuşdur. 12-liyə daxil olan şəhərlər lukumon adlanan başçılar tərəfindən idarə olunurdu. Bu başçılar həm də baş kahin idi. Belə ulukamlar ildə bir dəfə Volsini yaxınlığındakı baş məbədə toplaşıb federasiyaya hökmdar (baş lukumon) seçirdilər. Etruriyada mərkəzi hakimiyəti olmayan siyasi qurum tərəfindən idarə olunduğundan belə lukumonun, yəni etrusk federasiyası baş kahininin əlində real hakimiyət olmurdu. Etrusk şəhər-dövlətləri yaxındakı ətraf şəhərləri, kəndləri də əhatə edirdi, burada yaşayan əhali həmin şəhər-dövlətin tam hüquqlu vətəndaşı sayılırdı.

Etrusk ordusu haqqında bəlgələr qalmasa da, çəkilən rəsm və yapılan kiçik fiqurlarda zirehli döyüşçü geymi, qalxan, dəmir dəbilqə, nizə, xəncər, yay-ox, balta etrusk əskərlərinin görkəmini əks etdirir. Roma respublikası çağında və qonşu Yunan elindəki ev xanımlarının yaşam durumundan fərqli olaraq, etrusk qadınları açıq-saçıq gəzir, kef məclislərində ərlərilə birlikdə əylənirdilər. Qarışıq etnik boyların birgə yaşadığı etrusk toplumunda müxtəlif dialektlərin olması gerçək durumu əks etdirdiyi kimi ayrı-ayrı etnik gələnəklərin mövcudluğu da gerçək durumu sərgiləyirdi. Bu baxımdan, etrusk toplumunun gələnək və görənəklərini sənədləşdirən rəsm əsərlərində bir tərəfdən mehriban, sədaqətli ailə bağını, digər tərəfdən əxlaqsız pozqun qadınları, kollektiv parnoqrafiik səhnələri görmək oıur.

Etrusk toplumunda sənətkarlarla yanaşı tacirlər də önəmli yer tuturdu. Yunan qaynaqları etrusk dəniz quldurlarından bəhs edir, lakin etruskların Sardiniya, Korsika, Balear adalarında, hətta İspaniyada etrusk tacirlərinin kaloniyalar salması göstərir ki, ətraf ölkələrin bazarlarında onların önəmli ağırlığı varmış.

Uluslararası ticarətə önəm verən etrusk tacirləri Karfagendən fil sümüyü, yunan şəhər-dövlətlərindən isə bahalı sənət nəsnələri gətirir, bu ölkələrə mis, dəmir və etrusk sənətkarlarının hazırladığı nəsnələr aparırdılar. Avropadakı xalqlara metal, keramika, parça, bal satan etrusklar oradan da ölkəyə kəhrəba, qalay və əsir qullar gətirirdi.

**Dənizçilik**. Aralıq dənizinin batı sularında hegemonluğu ələ alıb uzaq ölkələrlə əlaqə quran etruskların o dönəmdə güclü dəniz donanması vardı. Burnunda taranı olan ilk gəmilərin, iki qanadlı lövbərin də VII əsrdə onlar tərəfindən ortaya çıxdığını söyləyirlər. Avarlı, yelkənli gəmilərilə uzaq ölkələrə üzən etrusklar mahir dənizçilər idi. Bu dönəmdə yunanlar *tirren* (etrusk) adını dəniz qulduru (pirat) anlamında işlədirdilər. M. K. Tseliyə görə, Amerikaya ilk gedən də etrusklar olmuş, sonralar onu "kəşf edən" avropalılar onların xəritəsindən istifadə etmişlər.



Strateji baxımdan qorunma imkanı olsun deyə, etrusklar liman şəhərlərini sahildən kənarda salırdı. Bugünəcən duran Florensiya, Piza, Siena, Peruci, Tarkvini, Roma şəhərləri həmin durumu əks etdirir. Lakin belə şəhərlərin dənizə çıxış yolu da olurdu. Yeri gələndə bunun üçün böyük kanallar da açılırdı. İtaliyanın quzey-doğusundakı Spina şəhərindən Adriatik dənizinə çəkilən kanalın eni otuz metr, uzunu üç kilometr idi. Etruriyada əldə olunan metal külçələri, aşılanmış dəri və sair xam mallları başqa ölkələrə əsasən gəmi ilə aparırdılar.

Quru yollara nisbətən dəniz yolu ilə aparıln tcarətə önəm verən etrusklar Aralıqdənizinin batı sularında güclü dəniz donanması ilə iki əsr boyu hegemonluğu əldən vermədilər,

ancaq IV-III əsrlərdə yunan və keltlərə yeniləndən sonra rəqabətdə zəifləyib əvvəlki şöhrəti itirdilər. Etrusk korsanları isə bir müddət peşələrini davam etdirdi.

**Basırıqlar.** Etrusk tikililəri özləri kimi zaman axarında dağılıb itmiş, yalnız möhtəşəm kurqanaltı basırıqları qalmışdır. Etrusklar evlərini, hətta məbədləri çiy kərpiçdən tiksələr də, «obiri» dünyanın varlığına tam inamları vardı, oradakı «evləri» böyük daş parçalarından tikirdilər. Ona görə də etruskların bir neçə yeraltı «ölülər şəhəri» günümüzə qədər qala bilmişdir.





Etrusk kurqanları

Basırıqlar üzərinə yığılan torpaq onlara kurqan görkəmi verirdi. Belə basırıq gələnəyini Qafqazdan aparan etruskların kurqanları da tipoloji baxımdan saqa (dış oğuz) kurqanları kimi obiri dünya üçün «ev» amacı daşıyırdı. Kurqanaltı basırıqlarda ayrıca otaqlar şəklindəki tikililər, adətən, ayrı-ayrı ailələrə məxsus olurdu. Bunu eyni soyadı daşıyanlara aid epitafiya yazılarında görmək olur. Əvvəllər bəsit görkəmi



Küzi yaxınlığında basırıq

ilə seçilən basırıqların sonralar zəngin görkəm alması toplum içində varlı adamların ortaya çıxması, elit təbəqənin artması ilə bağlı idi.



Arxitektura baxımından basırıq türləri Tsere elbəy basırığındakı kimi üstü böyük daşlarla tağbənd hörgüsü ilə örtülən uzun dəhliz formasında və ya Vetulon, Populon basırıqlarında olduğu kimi yenə tağbənd örtülü dördkünc yaxud dairəvi otaqlar şəklində tikilirdi. Belə basırıqlar daha öncə Kipr-Krit kulturunda vardı. Urartu məzarları da bənzər görkəmdə idi. Belə görünür ki, kurqan kulturunu İtaliyaya gətirən Anadoludan gələn köçkünlərmiş.



Külqabı

Etruriyada basırıq kulturunun gəlişməsi kurqanlarla paralel Villanova kulturunun davamı olan ölüyandırma gələnəyində də özünü göstərir. Əvvəllər adi görkəmli bəsit keramik qablarda ölənin külü saxlanırdısa, artıq bu külqabıların üzərində ölənin heykəlini düzəldir, qabı müxtəlif fiqurlu formada yapırdılar.



Ümumiyətlə Quzey Qafqaza, Güney-Doğu Avropaya, Güney Sibirə (Altaya), Doğu Türküstana və İtaliyaya aparılan kurqan kulturu Ön Asiyadan həmin bölgələrə köçən prototürk boyları, sonrakı çağlarda isə adını bildiyimiz saqa, hun, kuman, az, oğuz, qayı, etrusk və başqa türk boyları ilə bağlıdır.

Bu baxımda, saqa və etrusk kurqanları arasında oxşarlıq daha çoxdur. Hər iki basırıq kulturunda kurqanaltı otaqların içində qoyulan qab-qacaq, ölənin özəl nəsnələri, əlində kasa və sair atributlar bir-birini təkrar edir. Etruriyada ilk kurqanların 8-ci əsrdə ortaya çıxması belə düşünməyə əsas verir ki, kurqan kulturunu İtaliyaya gətirən bir türk boyu uzaqbaşı 8-ci əsrdə Anadoludan gəlib burada etrusk toplumuna qatılmışdır. Burada ilk yazılar da 8-ci əsrin sonlarında ortaya çıxır.











Ölənin son mənzilə yola salınmasında iştirak edənlərin ağlaşmadan çox şülən ovqatı, rəqs səhnələrinin təsviri verilən rəsmlər də basırıq divar freskalarında görünür.

Yas törənilə bağlı bəzəkli sarkofaqları, üstəlik ölənin heykəlini hazırlamaq üçün müəyən vaxt lazım idi. Görünür, bu işi görən ustaların ayrıca başdaşı düzəldən emalatxanaları olub. Belə ki, burada alibastr və yumuşaq daşdan yonulan bəzi başdaşılar üzərində eyni səhnələrin təsviri onların basmaqəlib üsulu ilə yapıldığını göstərir. Əsas vaxt isə öncədən hazırlanmış sarkofaqın qapağı üzərində heykəlin hazırlanmasına sərf olunurdu.

## SƏNƏTKARLIQ





**Keramika**. İtaliyada etrusk keramik nəsnələri özəlliklə m.ö.VIII əsrdən seçilməyə başlayır. Həmin əsrin ortalarına qədər dulusçuluqda istifadə olunan gil Çerveteridə etrusköncəsi *Villanova* kulturunda görünən gil məmulatlarından əla keyfiyətilə seçilirdi. Bu gildən hazırlanan qablar sobada yaxşı bişır, aldığı qara rəng yaxşı cilalanırdı. Yüksək ustalıqla hazırlanan müxtəlif fiqurlu belə nazik divarlı (*nazik bukkero*) qablar yeni naxışlar üslubu, zərifliyi və gözəlliyi ilə əvvəlki çağlara aid qablardan kəsgin fərqlənirdi.



Çerveteri nekropolundan çıxan m.ö. VII əsrə aid fiqurlu bukkero gil qabı







Moskva-Peterburq muzeylərində saxlanan m.ö. VII-VI əsrlərə aid *bukkero* qabları

Bu çağın nazik divarlı *yüngül*, qalın divarlı *ağır bukkero* qabları sırasında müxtəlif fiqurları ilə seçilən valehedici sənət nümunələri vardır. Yüksək sənət fantaziyası ilə gerçəkləşən belə qablar indi dünya muzeylərinin ən qiymətli eksponantları sırasında yer alır.



Kyuzi, Orvieto dulusçuları VI əsrin sonunda nazik bukkero qablarına nisbətən daha qalın qablara və belə ağır qablar üzərində daha realistik rəsmlərə üstünlük verirdilər. Bu tip qablar üzərində relyefli qabartma və cizgi üsulu əvvəlki hamar qravüra üslubunu əvəz






edirdi. Bukkero stilində qabların düzəldilməsi VII əsrin sonundan başlayaraq geniş vüsət almışdır və yapılan qab-qacaq, qəndil, silindrik mücrü dulusçuluq sahəsinin necə inkişaf etdiyini aydın göstərir. Bu keramik qablarla yanaşı, bəzəkli tunc nəsnələr və özəlliklə şüyrələnmiş əl

güzgüləri hazırlayan mahir ustalar vardı. VI əsrin ortalarına doğru artıq oxra çalarlı boya ilə qara fonda çəkilən rəsmlər görünməyə başlayır. Getgedə təkmilləşən bu üsul keramika üzərində çəkilən heyranedici rəsm əsərlərinin ortaya çıxmasına səbəb olur. Bunun örnəyini qızların bəzənmə görüntüsü təsvir olunan 350-300-cü illərə aid Çvita Kostellyano qabı üzərindəki şəkil aydın sərgiləyir:



Dövrünə görə metalişləmə sahəsində etrusklar çox irəli çıxmışdılar. Yarımadanın filiz yataqları, metal qaynaqları Etruriya ərazisində idi. Onlar üzdəki metal külçələri toplamaqla kifayəilənmir, yeraltı dərin şaxtalar qazırdılar. Buradan çıxarılan mis, gümüş, dəmir, sink külçələrini Britaniyadan gətirilən qalay ilə qarışdırıb tunc əldə edirdilər. Metal əritmək üçün kiçik sobalara üstünlük verilirdi. Görünür, Anadoludan metallurgiya sahəsindəki bilgi və zəngin təcrübə ilə İtaliyaya gəlmiş etrusklar yeni yurdda onu daha da inkişaf etdirmişlər.



**Tunc nəsnələr.** İtaliyada uzun müddət metalişləmə sahəsində tunc heykəl və fiqurlar düzəltmə sənətinə görə etrusk ustalarına çatan olmamışdır. Antik çağ yazarları dönə-dönə etrusk sənətkarlarının metalişləmə bacarığından ağız-

dolusu danışmışlar. Böyük Plini Etruriyada hazırlanan sənət nümunələrinin başqa ölkələrdə də məşhur olduğunu qeyd edirdi.



İndinin özündə belə, m.ö.VI əsrdə yapılmış "Kapitoli qurdu" adlanan dişi qurd fiquru adamı heyran edir. İndi Romanın simgəsi sayılan bu kompleksə qurdun əmizdirdiyi iki cocuq (Rem ilə Romul) fiquru isə XV əsrdə hazırlanıb əlavə olunmuşdur. Burada m.ö. V əsrə aid



tunc şamdandan qalmş bir hissədə döyüşçü geyimindəki kişiyə kasa uzadan qadın fiquru təsvir edilmişdir. Zevsin istəyilə Apollonun göndərdiyi əskər görünümündə iki qanadlı mələk Troya savaşında ölən Sarpedonu yerdən astaca qaldırıb dəfn etmək üçün Likiyaya evinə aparırlar. Həmin səhnəni əks etdirən bu aşağıdakı fiqur m.ö. IV əsrin əvvəlinə aid qiymətli nəsnələrin saxlandığı tunc sandıqcanın qapaq tutacağıdır. Digər tunc fiqurda isə dalğalar üzərində hərəkət edən Günəş tanrısı Usil təsvir olunmuşdur.


Vulçi,
m.ö.V əsr

Tit Liviy yazırdı ki, romalılar konsul Fulviy Flakkın başçılığı ilə Bolsini şəhərini tutub yağmalayanda məbədlərdən yığılıb Romaya daşınan nəsnələr içində iki minəcən kiçik tunc heykəl vardı. Bu heykəllər ona görə Romaya aparılırdı ki, onları əridib sikkə

kəssinlər, çünki Karfagenlə müharıbəyə pul lazım idi. Etruriyada sikkə basılması m.ö. V əsrdə ortaya çıxmış, m.ö. II əsrəcən davam etmişdir. Altun, gümüş və tuncdan kəsilən sikkələr üzərində yunan pulları kimi müəyən şəhərləri himayə edən tanrıların, dəniz atlarının, ikiağızlı balta, təkər şəkli, həmçinin şəhər adlarıni bildirən kiçik yazılar da olurdu.

**Zərgərlik.** Etrusk zərgərlərinin m.ö.VII və sonrakı əsrlərdə düzəltdiyi bəzək nəsnələri sırasında qolbağı, sinəbənd, üzük, sırğa və sancaqlar diqqəti çəkir. Bugün adamı heyran edən bu bəzək əşyaları etrusk ustalarının yüksək zövqündən, duyumlu sənətkar fantaziyasından xəbər verir. Vulçi şəhəri basırığından tapılan üzüm salxımı formasındakı altun sırğa gözəlliyilə diqqəti çəkir. Gümüş və fil sümüyündən düzələn nəsnələr üzərində nazik qızıl təbəqələrlə vurulmuş bəzəklər, zövqlə yapılan qızıl-gümüş bəzək nəsnələri etrusk zərgərlərinin baçarığından xəbər verir.



Tseredə aşkar edilən Reqolini-Qalassi basırığında qadının üzərindəki sırğa, qolbağı dəsti, boyunbağı zərif naxışlarıyla diqqəti çəkir. Belə kiçik ölçülü bəzək nəsnələrinin üzərinə tanrıların və müxtəlif heyvan fiqurlarının qaynaq edilməsi üsulu sonrakı çağlarda daha da gəlişmişdir.

Etrusk qadınları boyadan geniş istifadə edirdilər. Bunun etnoqrafik bəlgələri tapılan çeşidli ənlik-kirşan qablarından

bəlli olur. Kübar etrusk qadınlarına məxsus parfümeria bolluğuna Misirlə ticarət əlaqəsi də rol oynayırdı. Etruskların etnoqrafiyasında özəl yeri olan bəzəkli əl güzgülərini qadınlar daha çox sevirdi.



**Güzgü**. Latınların *spekulum* dediyi əl güzgüləri tuncdan hazırlanırdı, bəzilərinin tutacağı ağac və fil sümüyündən olurdu. Cilalanan üz tərəfə əlavə olunan qalay da görüntünün keyfiyətini artırırdı. Etrusk güzgüləri yalnız yaraşığı ilə deyil, həm də arxasında çəkilən cizgi şəkilləri ilə diqqəti çəkir. Adətən rəsmlərdə etrusk mifologiyasında yayğın olan süjetlər, suratlər, ən çox da etruskların tapındığı tanrı və mifik qəhrəmanlar təsvir olunurdu.

Güzgü rəsmlərində yunan mifləri, Troya ilə bağlı olaylar da geniş yer tutur. Belə güzgülərin əhəmiyəti cox böyükdür, çünki rəsmləri çəkilmiş obrazların adları da yazılmışdır, bu isə artıq yazılı qaynaqdır.



Uni
Filae
Turan
Althaia
Menrva
Elkintre

Bugünəcən çoxlu etrusk güzgüsü tapılmışdır, muzey və özəl kolleksiyalarda olan güzgülərin sayı iki mindən

artıqdır. 1979-dan onların kataloqunu sistemli şəkildə hazırlayan *Etruscanorum Speculorum* adlı komitə yaranmışdır. Troya gündəmi, Helen və tarixdə etrusk adları ilə bəlli obrazlar təsvir olunmuş bu güzgü də Vulçidə tapılmışdır.[18]



Vulci güzgüsü

Yuxarıda soldan sağa: **TURAN**, **HERKLE**, **EPEUR**, **TINIA**, **TALNA**; Ortada soldan sağa: **AEKAI**, **MEAN**, **ELKHINTRE**, **ELINAI**, **MENLE**, **AGHMEMNUN**, (*lasa*) **THIMRAE**; Aşağıda: (*lasa*) **RAGUN.**

[18] *Pallottino,* 1975.

**Heykəl və rəsm kulturu.** Indiyəcən basırıq divarlarında qalmış m.ö. VI-V əsrlərə aid rəsm əsərləri alabəzək boyaları, müxtəlif mifik, dini və real etnoqrafik bayram, şülən, yas səhnələri ilə diqqəti çəkir. Sonrakı yunan-latın dönəmlərində monumental heykəllərə önəm verilməsi etrusk toplumunda görünmür. Onlar qranitdən böyük büst və bütöv boylu heykəllər deyil, daha kiçik görkəmli fiqurlar düzəltməyə üstünlük vermişlər. Lakin adda-budda böyük etrusk heykəllərinə də rast gəlmək olur, özəlliklə tuncdan tökmə böyük heyvan fiqurları daha cox yayılmışdı.





Etrusk sənətkarları monumental mərmər heykəllər yaratmağa meyl etməmiş, daha çox kiçik ölçülü fiqurlar düzəltməyə, etrusk toplumunun çox sevdiyi rəngarəng, alabəzəkli

boyalarla süslənmiş sənət əsərləri yaratmışlar. Etrusklarla birlikdə toplumun hörmət etdiyi rəssamlar, heykəltəraşlar, musiqiçilər, yazarlar, bir sözlə, yaradıcı insanlar da əriyib getdi. Ançaq etrusk soylu italiyanların içində sənətkara qayğı, sənət əsəriə sevgi duyğusu əsrlərlə yaşadı. Tarixi şəxsiyət olan Avl Mesenat da onlardan biri idi.







Basırıqlarda qadın heykəlləri

Etruskların ədəbiyat, səhnə əsərləri haqqında tarixi bilgi olmasa da, dolayı məlumatlardan bəlli olur ki, ədəbiyat da, teatr da varmış. Belə ki, bəzi sarkofaqlar üzərindəki rəsmlər içərisində yunan tragediyalarından verilən bəlli səhnələr teatrla tanışlığı əks etdirirsə, Varronun m.ö.II əsrdə Volnius adlı birinin yazdığı tragediyanı xatırlaması etrusk dramaturgiyasının mövcudluğundan xəbər verir. Romalı aktyorlar içində etruskca "oyunçu" anlamında *ister* sözündən yaranmış *histrion* adlanan oyunçular vardı ki, onlar xalq şənliklərində Bakı meyxanaçıları kimi gülməli qoşuqlar (şeir) deyirdilər. Sonralar belə qoşuqların əsasında İtaliyada satira janrı yaranmışdır.

Etrusk dini görüşləri sonrakı latın yazarlarının əsərlərində yer alsa da, bədii ədəbiyatla bağlı bunu söyləmək olmur. Tit Liviy yazır ki, indi romalı uşaqlar yunan elmini öyrəndikləri kimi, bəlgələrə görə keçmişdə də etrusklardan savad öyrənirmişlər.[19]

**Musiqi və rəqs kulturu**. Etrusk rəssamlarının çəkdiyi şəkillərdə musiqiçilərə və rəqs edənlərə geniş yer verilmişdir. Hər şeydən öşcə, etrusk rəsq səhnələri içində yallı oyunları diqqəti çəkir. Bununla yanaşı, ayrıca rəqs edənlərin əl-qol hərəkətləri Azərbaycan dərviş oyunlarını və özbək rəqslərini xatırladır.



Dərvişlərin rəqsi





Ayrı-ayrı basırıqlardakı rəsmlər

---

[19] *Ливий*, IX, 36, 3.

Məişət nəsnələri, keramik qablar, basırıq divarları üzərində çəkilmiş şəkillərdən belə görünür ki, etrusklar şənliklərdə olduğu kimi yas törənində də musiqidən istifadə edirmişlər. Ayrıca nəğmə mətnləri, poetik janr örnəkləri qalmasa da, bəzi qısa yazılarda ritm yaradan qafiyələrə rast gəlmək olur. Lakin hələlik etrusk dilinin şifrəsi açılmadığından belə şeir örnəkləri haqqında qəti fikir söyləmək olmur.



Əlimizdə olan təsviri sənət əsərləri göstərir ki, etruskların bayram və şənlik məclisi, şülən-banketləri, idman yarışları, dini mərasimləri və hətta yas törənləri musiqisiz ötüşmürdü. Musiqiyə verilən belə önəm toplumda talantlı musiqiçilərin yetişməsi, mahir sənətkarların ortaya çıxması üçün əlverişli şərait yaradırdı. Savaşda istifadə olunan yüksək səsli borular

misdən və dəmirdən hazırlanırdı. Çeşidli çalğı alətləri sırasında fleyta, ikibaşlı tütək, sinc, zurna, qaval, zınqrov kimi müxtəlif melodiyaları səsləndirə bilən alətlər görünür.

Etrusk divar rəsmlərində ov ovlama, balıq tutma səhnələri gösrərir ki, onlar ovçuluq, balıqçılıqla da məşğul olurmuşlar. İtlə qaban, maral, dovşan və quş ovuna həm piyada, həm də atla çıxan etrusklar ov etməyi çox sevirdilər. Qaynaqlara görə, hətta bəzi heyvanları tora salmaq üçün tütəklə səslənən melodiyadan, ovsunlayıcı musiqidən də istifadə olunurmuş.





Tarkvini,"Avqurlar" basırığı, m.ö.VI əsr



Kluzi basırığı, m.ö.V əsr

Rəqs səhnələrilə yanaşı, etrusk



atletika, güləş, üzgüçülük, yumuruq döyüşü təsvirləri də geniş yayılmışdı. Bu səhnələr etrusk toplumunda idmana böyük önəm verildiyini göstərir. Çox güman ki, qladiator döyüşü və bugün də davam edən Roma güləş növü etrusklardan qalma qaydaları saxlayır.

# ETRUSK DİLİ

Hər bir dilin özəl fonemlər sistemi (səs quruluşu), leksikası (söz dağarcığı), qramer qurulrşu olur. Etrusk dilini öyrənmək üçün dilin ayrı-ayrı qatlarını araşdırmaq lazım gəlir. Üstəlik bu dilin yayıldığı bölgələrin dialekt özəlliyi, yazı qaydaları da diqqətə alınmalıdır.

Yazı örnəkləri olsa belə şifrəsi açılmamış bir ölü dilin dialekt özəlliklərinə şərh vermək zor işdir. Doğrudur, bugün Toskanada yaşayan etruskların bioloji-genetik varisləri italyan dilində danışakən sözləri fərqli tələffüz edə bilər, lakin bunun etrusk dilinə yox, italyan dilinə dəxli var. Adilə xanım Aydanın yazdığına görə, bu bölgədə *c* (*k*) səsi *x* kimi deyilir və bu özəllik *gorgia toscana* (toskana qırtlağı) adlanır.[20] Etrusk yazılarında eyni adın, sözün müxtəlif yazılış fopmaları aydın göstərir ki, bunların müəyən hissəsi dialekt fərqlərilə bağlıdır. Uzmanlar etrusk dilinin güney və quzey dialektləri olduğunu söyləyir.

**Leksika**. Dildə işlənən sözləri bildirdiyi anlamlara görə qruplara ayırıb öyrənməklə bu dilin hansı dil ailəsinə bağlı olduğunu müəyən etmək asanlaşır. Bu baxımdan, etruskcada mifoloji anlam daşıyan, tanrıadı (teonim) kimi işlənən və dini görüşlə bağlı bəzi sözlərin müəyən olunması etruskologiya elminin uğurlarından sayılmalıdır. Uzmanlar etrusk yazılarında işlənən ***ais*** (sonralar ***eis)*** və cəm halda ***aisar*** sözünün "tanrı" anlamı daşıdığını söyləyir. Maraqlıdır ki, eyni durum Skandinav xalqlarının dilində də özünü göstərir. Özəlliklə, island dilində tanrı anlamında **æs** [au:s], cəmdə **æsir** sözü işlənir.[21] Döğrudur, skandinav dillərindəki *as* sözü Avropanın quzey-batı bölgələrinə Asiyadan gəlmiş qədim *as//az* boyları,

---

[20] *Ayda,* 1987, 232.
[21] *Исландско-русский словарь.* М. 1962, 49.

həmin boyların baş tanrısı Odinin və digər ***as*** tanrılarının ilk məskəni ***Aser*** (Azər) yurdu ilə bağlanır.[22] Ancaq etruskcada *ais//eis, aisar* sözlərinin skandinav saqalarındakı *as, aser* sözlərilə əlaqəsinin olub-olmaması hələlik bəlli deyil. Hər halda, belə bir əlaqə birbaşa olmasa da, dolayı bağlantı var. Belə ki, aser//asar tanrıadını aslar Skandinav ölkələrinə, etrusklar da İtaliyaya Asiyadan (Azər yurdundan) aparmışlar.

Dilin leksik qatında şəxs adları (antroponimlər) önəmli yer tutur. Etruskoloqların verdiyi Malamenas, Merkana, Catharnai, Ceithurna, Cala, Teithurna, Tarna, Tulumnes, Tusnuties, Sentina, Satlana, Spurinna, Unata, Urinati kimi etrusk adları sırasında türk onomastikası üçün yad olmayan elementlər də görünür. Belə ki, *Hathli* soyadında *hat-lı* modeli, latınlarda *Caius//Gaius* şəklində işlənən etruskların *Cae//Cai* adında oğuz boyadı *kayı* (qayı), Churchle [Xurxle] Kurokle, Pleku-Pelek, Tute-Tutu, Ulthes-Ulduz, Karkana-Karakan şəxs adlarının paralelliyi vardır. Alfiya, Atiliya, Perca, Culni, Cainei, Sarsinaia, Peci, Araziya, Pinariya, Tanusa, Suana kimi etrusk qadın adlarında Sarsın Ay, Bikə adları seçildiyi kimi, sonda sadalanan adlarda da axarsu ilə bağlı Araz, Pınar, Dəniz və qutsal Su-Ana adları görünür.

Əgər *Arnth* adının *Arnza* [Arnca] forması kiçiltmədirsə, onda türk dillərindəki *-ca* (Qaraca) şəkilçisi görünməkdədir. Şəxsin adında hansı soydan-boydan olmasını (koqnomen) göstərən müxtəlif şəkilçilər vardır. Örnəyin, turs boyundan *Tursikina* etrusk adında *-ki* morfemı *bizimki, onunki* sözlərində olan *-ki* şəkilçisilə yaxındır. Ad sistemində işləkliyilə diqqəti çəkən bir sıra sözlər var ki, etrusk yazılarında onlar çox işlənir: Laris, Aule, Larth//Lartha, Arnth//Arntia və b.

Etrusk dilinin hansı dil ailəsinə mənsub olmasını müəyən etmək üçün bu dildə qohumluq bildirən terminlərin düzgün

---

[22] *Azər xalqı*, 2005, 11-24.

tapılması gərəkir. Uzmanlar etrusk dilində qohumluq bildirən sözlər sırasında əmi, dayı, bibi, xala, bacı mənasında işlənən sözlərin olmadığını qeyd edib *apa*, *ati*, *klan* (oqlan), *sex* (qız), *neftis* (nəvə), *ruva* (qardaş), *puya* (arvad, qadın), *nene* (nənə, dayə), *papa* (baba) kimi sözlərin bildirdiyi mənaları verirlər ki, bunların da çoxu türk dillərində özünü göstərir.[23]

Etrusk yazılarında vəzifə bildirən *camthi* (kamti), *parnix, purth, methlum, zilax, tamera, makstrev* kimi sözlər işlənir, lakin bu titulların konkret anlamı bəlli deyil. Bəzi uzmanlar *mech* (mex) sözünün "xalq" anlamı daşıdığını güman edirlər. Etruskların *lukumon* titulunu hökmdar və baş kahin olan şəxslər daşıyırdı.

İtalya dilçisi prof. M. Alineyi etrusk dilində işlənən *tarxon, camthi, zilax* kimi titul bildirən sözlərin vaxtilə macar dilinə də keçmiş (*kende, dyula*) türk sözləri (*tarkun, kende, yula*) olduğunu yazır.[24] Müəyən sahələr üzrə sənətkarları bildirən terminləri və peşə-sənət bildirən sözlərin bir qismini başdaşı yazılarından öyrənmək olur. Belə epitafiyalardan bəzilərinin iki dildə yazılması isə çözümə yardım edir. Örnəyin:

TLE 472: (latın): **q. scribonius c. f.** ; (etrusk): **vl . zicu**

Latınca *scribonius* sözünün yazar, yazıçı anlamı bəllidir, onun qarşılığı etrusk variantında *zicu* (ziku) sözü ilə verilmişdir. Deməli, etruskca *ziku* sözünün "yazar" anlamı var.

TLE 541: (latın): **ar. trebi. histro;** (etrusk): **ath: trepi: thanasa**

Latın dilində teatr aktyorlarına *histr(i)o* deyilir və yazının etrusk variantında onun qarşılığı *tanasa* sözüdür. Deməli, etrusklar aktyora *tanasa* demişlər. Əslində, latın dilindəki

---

[23] Latıncanın *nepōs* (h.a. **nepōts*) terminilə əlaqəsi görünən etrusk dilindəki *neftis* sözünün *nəvə* və ya *qardaş//bacı uşağı* anlaminda olması hələ dəqiq müəyən edilməyib.

[24] *Alinei,* 2003.

*histrio* sözü də etruskcadan alınmadır. Tit Liviy yazır ki, etrusklar fleyta musiqisilə rəqs edən rəqqasa ***ister*** deyirdilər, belə oynamağı onlardan mənimsəyən latın rəqqaslar latınca *histrio* adlandı.[25] Görünür, tanasa sözünün qarşılığı kimi verilən histro sözü sonralar latın dilində aktyor (artist) anlamı ilə işlənmişdir.

**Saylar**. Bugün dünya xalqları yazıda ərəb və rum (latın) rəqəmi adlanan saylardan istifadə edirlər. Əslində, rum sayı etrusklardan alınmadır:




| etrusk | latın | ərəb |
|---|---|---|
| I | I | 1 |
| Λ | V | 5 |
| X | X | 10 |
| ↑ | L | 50 |
| ( ✳ | C | 100 |

Etrusk rəqəmlərini daha çox başdaşı yazılarında görmək olur. Örnəyin, *Larthi Kraknei Larisal* adı yazılmış bu sarkofaqda ölənin yaşı (*əril*) †XXΛ rəqəmlərilə verilmişdir: **LARTHİ • KRAKNEİ • LARİSAL • RİL • †XXΛ •**




Etrusk yazılarında say bildirən sözlər ilk baxışda tapılmış kimi görünsə də, onları diqqətlə araşdıranda bəlli olur ki, bu sahədə uğurdan danışmaq tezdir. Paris Milli kitabxanasında saxlanan qədim etrusk zəri üzərində saylar rəqəm və nöqtə ilə deyil, sözlərlə verilmişdir. Etruskologiyada say

---

[25] *Ливий*. VII. 2. 6.

bildirən sözlərin 1-*thu,* 2-*zal* (*esal*), 3-*ci* (*ki*), 4-*ša,* 5-*max,* 6-*huth* kimi oxunması geniş yayılmışdır, çünki kubun qarşı tərəflərində rəqəmlərin cəmi zərin üstündəki nöqtələrə uyğun olaraq yeddi sayını verir: 1+6=7; 2+5=7; 3+4=7. Bəzi uzmanlar isə *huth* sözünü 4 sayına, *ša* sözünü isə 6 sayına aid edirlər.




Bu say bildirən sözləri sırası ilə Polat Kaya (*pr, ki, zal, mak, ma, hut*), Selahi Dikər (*thu, ki, huth, ça, mal, zal*) və ola bilsin ki, mənim bilmədiyim kimsələr də türkcə oxumaq istəmişlər. Haluk Berkmen isə zər üzərindəki yazının güləşdə hakimin işlətdiyi göstərişlər (*gey-aç, kal-kaç, alt- üst*) olacağını ehtimal etmişdir. Vaxtilə zərin üzərində olan sözlərin təxmini transkripsiya ilə verildiyini, zərin *pr* yazılan üzünü isə başayaq tutaraq oxuduqlarını görüb, bəzi düzəlişlər vermişdik:[26]

Etruskoloqların oxuduğu variantla (yuxarı sıra) bizim variant (aşağı sıra) arasında bu fərqlər vardır:

| | | |
|---|---|---|
| VD tu | AM ša | OVB huth |
| QΛ pr | AVl pla | ΘVB hlth (haltı) |

Göründüyü kimi, 1, 2, 5, 6 sayları zər üzərindəki düzümə uyğun gəlir, 3 və 4 sayları isə onları bildirən sözlərin doğru transkripsiyası ilə bağlıdır.

| etruskoloqların oxuması | bizim variant |
|---|---|
| 1 VD tu | 1 QΛ pr (bir) |
| 2 JAI zal (esal) | 2 I) ki (iki) |
| 3 I) ki | 3 JAI ? |
| 4 AM ša | 4 ↓Aᗰ ? |
| 5 ↓Aᗰ max | 5 AVl pla (bilək) |
| 6 OVB huth | 6 ΘVB hlth (haltı) |

[26] *Azər xalqı,* 2000, 152-153; Etruskca "beş" sayının çuvaş dilindəki *pilĕk* (bilək) variantı ilə işlənməsi etrusk yazılarında başqa sayları müəyən etməyə çuvaş sayları yardımçı ola bilər: pĕr (1), ikĕ (2), viç (3), tăvată (4), pilĕk (5) ult (6) və s.

**Əlifba**. Etrusk əlifbası üzərində bir az geniş dayanmağa ehtiyac var, çünki bugün dünya xalqlarından çoxunun istifadə etdiyi latın qrafikalı əlifbanın kökündə etrusk əlifbası durur. O əlifba da qədim türk əlifbası ilə eyni qaynaqdandır.

Yazıdan istifadə edən qədim xalqların toplumda yazıb oxuya bilən mirzələrə ehtiyacı vardı, ona görə də bitikçi (katib) və dilmancların hazırlanması üçün məktəblər yaranırdı. İlk dəfə sumerlərin yaratdığı belə məktəblər sonralar Ön Asiyada yayğınlaşdı, bu gələnəyi etrusklar da İtaliyaya gətirmişdi. Etrusk yazısı kətan parçaları və üz tərəfinə mum çəkilmiş ağac lövhələr üzərində öyrənilirdi. Kətan üzərində quş qanadından, ağac üzərində qamışdan düzəldilən qələmdən, mürəkkəb kimi doğal boyadan istifadə olunurdu. Romalılar da uşaqlarını yazıb-oxumağı öyrənmək üçün etrusk məktəbinə göndərirdilər.

Marselian şəhərinə yaxın bir etrusk basırığnda "Marselian əlifbası" adlandırılan yazı lövhəsi tapılmışdır. Fil sümüyündən düzəlmiş lövhə üzərinə yayılmış mum qalığı və yuxarı tərəfdə sağdan sola cızılmış 26 hərf vardı. Belə lövhələrdən etrusk məktəblərində yazı öyrənmək üçün istifadə olunurdu:

(*Lövhənin şəkili və çizgi kopiyası*)





**Yazı lövhesinde etrusk əlifbası**

Etrusk əlifbası yalnız bu yazı lövhəsində deyil, keramik qablar və başqa nəsnələr üzərində də tapılmışdır. Belə nümunələrdə əlifbanın soldan sağa düzülüşünə də rast gəlmək olur. Elə örnəklər var ki, orada hərflərin sıralanmasında və ya sayında yanlışlıq görünür:



Etrusk əlifbasında bəzi hərflərin fərqli şəkilləri və eyni səsi bildirən fərqli hərflərin olması doğaldır. Belə ki, minil boyunca işlənən yazının mərkəzi hakimiyyəti olmayan xalqın yaşadığı bölgələr üzrə fərqlənməsi, həm də bu zaman içində inkişaf edən dilin fonetik sistemində baş verən dəyişmələrə uyğunlaşması ilə ortaya çıxan fərqləri təbii saymaq gərəkir.

Zaman axarında etrusk və türk əlifbasında olan işarələrin bəzisi dəyişikliyə uğrasa da, hər iki dilin yazılarında görünən eyni cizgili hərflər daha çoxdur. Verilən bu qarşılaşdırmada görünən eynilik ortaq qaynağı açıq sərgiləyir:



Minil davam edən etrusk yazı gələnəyində dilin inkişafı, dialektlərin bölgələr üzrə fərqlənməsi yazı qaydalarına təsir etdiyi kimi, əlifbadakı hərflərin sayında və cizgisində də iz buraxmışdır. Lakin bu fərqlər Orxon yazıları ilə Yenisey yazıları arasında olan qrafik fərqlərdən azdır. Türk və etrusk runik əlifbalarının bir qaynaqdan olması eyni səsin hər iki əlifbada eyni işarə ilə verilməsində daha aydın görünür:




Əvvəllər ellinlərin yazı gələnəyi olmadığını vurğulayan və Elladada əlifbanın ortaya çıxmasını finiklərə bağlayan, yunanların dəri üzərində yazılan kitabələrə *dephtera* (dep-deri) deməsini, istifadə edilən əlifbaya *finik yazısı* deyiminin isə uzum müddət yunan dilində davam etməsini yazan Herodot kadmelərin yunanlara gətirdiyi əlifbada yaranan fərqləri belə izah edir: "Öncə başqa finikiyalılar kimi kadmelərin yazısı finik əlifbasında idi. Sonralar dillərində baş verən dəyişmələr əlifbaya sirayət etmiş və bəzi hərflərin fərqli formaları yaranmışdır." [27]

Siciliyalı Diodora görə, Homerdən öncəki yunan şairləri pelask əlifbasından istifadə etmişlər, bu əlifbaya dayanan yazı türləri Avropaya da yayılmışdır. Belə əlifbanı İtaliyaya pelasklar gətirmişlər. Diodorun fikrinə Böyük Pliniy də tərəfdar çıxmışdır. Bu yorumlar etruskların pelask sayılması ilə bağlıdır. Latın əlifbası da etrusk əlifbasından yaranmışdır.

---

[27] *Herodot*, V. 58.




Latın əlifbasının Etrusk əlifbsı əsasında yaranması quşqusuzdur. Artıq bunu etiraf edənlərin sayı artmaqdadır: "Latın əlifbası üzərində illərlə davam edən mübahisə artıq çözülmüşdür. Bəzilərinin iddia etdiyi kimi, latınlar əlifbanı Kumedə yerləşən yunanlılardan deyil, quzey qonşuları etrusklardan almışlar."[28] Skandinav runlarının da etrusklardan alınması ensiklopediyalarda qeyd olunur.[29] Lakin bu məsələ hələlik mübahisəlidir.




Burada verdiyimiz etrusk əlifbası uzmanların ümumi rəyinə görə etruskologiyada qəbul olunmuş variantdır. Lakin bu variant qüsursuz deyildir və buradakı yanlışlıq bir sıra sözlərin düzgün oxunmasına imkan vermir.

Avrasiyaya yayılmış runik əlifbaların qədim damğalardan yaranması quşqusuzdur. Əhməd Çəfəroğlu, Muharrem Ergin

---

[28] *Bloch,* 1963, 120.
[29] *Britannica*, XIX t., 1970, 755.

və başqa dilçi alimlər Göytürk əlifbasının türk toplumunda yarandığını söyləmişlər, lakin bu fikiri subut edən araşdırma aparmamışlar. İlk dəfə sistemli araşdırma "9 Bitik" əsərində verilmiş, runik hərflərin qədim tük damğalarından yaranma yolları örnəklərlə göstərilmişdir.[30]

Doğrudur, etruskologiya elmi etrusk əlifbasındakı hərflərin bildirdiyi səsləri düzgün müəyən etməsilə uğur qazanmışdır, lakin bəzi hərflərin oxunuşu tam aydınlaşmayıb. Bizcə, belə hərflərin hansı səsi bildirməsini dəqiqləşdirmədən etrusk yazılarını oxumaq bir sıra yanlışlıqlara yol açır, həm də etrusk dilinin səs quruluşunun dəqiq təsvir edilməsinə mane olur. Belə mübahisəli hərflərin fonetik dəyərini burada müəyən etmək iddiasında olmasaq da, bəzisi haqqında müşahidəmizi açıqlayıb uzmanlarla paylaşmağın yararı vardır.

Etrusk yazılarında [f] səsi kimi oxunan *8* hərfi əslində [b] kimi oxunmalıdır. Bunu ***Tebariy*** adının Pirqi lövhələrində aramey və etrusk yazılış variantlarında görmək olur:

arameycə  - TBRYʾ

etruskca  - THEBARİEİ

Bu adın yanlış olaraq etruskca *Tefariy* kimi oxunmasının bir səbəbi də etruskologiyada dərin kök atmış "etrusk dilində [b], [d], [g] samit səslərinin olmaması" fikrindən doğur. İki dilli yazılar belə mübahisəli məsələlərin aydınlaşmasına yardım edir. Yenə [b] səsilə bağlı bir adın latın və etrusk dilində yazılışını əks etdirən ikidilli yazıya (**TLE 462**) baxaq.

etrusk: *cae trepu*
latın: *c. treboni*

---

[30] Vaxtilə Mirzə Fətəli Axundov latın qrafikalı əlifba tərtib etsə də, onu Azərbaycan Demokratik respublikasını quranlar gerçəkləşdirdi, biz də onu 1991-də bərpa etdik. O vaxt Dövlət Əlifba Komissiyasının rəhbəri idim. Mənə irad tutanlardan bəzisi deyirdi, madam ki əlifbanı dəyişirsiniz, elə Göytürk əlifbasını qəbul edin. Mən yarızarafat cavab verirdim ki, elə latın əlifbası da bizim qədim əlifbadan yaranıb.

Bu yazıda *Cae* (Kay) *Trepu* adının latınca *C. Treboni(us)* şəklində yazılması p//b, u//o qarşılığını ortaya çıxardır. Bəlli olur ki, etrusk yazısında *p//b* və *u//o* qoşa səsləri eyni hərflə verilə bilir. Bu *p//b* qarşılığını *Trebi* adının keçdiyi başqa bir ikidilli yazı da təsdiq edir:

(**TLE 541**) etrusk: *ath: trepi: thanasa*
latın: *ar. trebi. histro*

Göründüyü kimi, etrusk dilində [b] səsinin olmadığını söyləmək doğru deyildir. Belə düşünmək olar ki, əvvəllər etrusk yazılarında ***B*** hərfilə verilən bu səsi sonrakı çağlarda ***8***, bəzi yazılarda isə **1** hərfilə bildirmişlər.

Etrusk əlifbasında işarələrin doğru oxunması çox önəmli məsələdir. Özəlliklə, dilarxası samit səsləri bildirən hərflərin dəqiqləşməsinə ehtiyac vardır. Türk dili kimi etrusk dilində də səsuyumu (sinharmonizm) qanunu olduğu üçün bu samit hərflərin dilönü (incə) və dilarxası (qalın) saitlərlə işlənməsi diqqətə alınmalıdır. Türk runikasında sait-samit harmoniyası etrusk yazılarında da özünü göstərməlidir. Nəzəri baxımdan dilarxası samitlərə aid hərflər etrusk dilində bu səsləri bildirə bilər:

| türk | k | q | g | ğ | etrusk | k | q | g,ğ,v | x,h |
|---|---|---|---|---|---|---|---|---|---|
| | 𐰚 𐰜 𐰝 | 𐰶 𐰸 | 𐰏 | 𐰍 | | 𐌊 𐌂 | 𐌒 ↑ | 𐌅 | 𐌇 |

Bu baxımdan, etruskca yazılarda 𐌅 hərfinin yalnız [v] samit səsi kimi, ↑,↓ hərfinin [x] samit səsi kimi oxunması yanlışdır. Yeri gəldikcə, bəzi yazıların oxunuşunda bu işarələrin bildirdiyi səslər üzərində dayanacağıq. Burada yalnız 4 hərfin etrusk yazısında 4, türk runikasında isə 9 səs bildirməsi faktına önəm vermək gərəkir, çünki bu durum səs harmoniyasını etrusk dilində əks etdirmir. Bu baxımdan, etrusk hərfləri də ən azı 6 saiti bildirməlidir.

| etrusk | a | e | i | u | |
|---|---|---|---|---|---|
| | 𐌀 | 𐌄 | 𐌉 | 𐌖 | |
| türk | a ə e | e | ı i | o u | ö ü |
| | 𐰀 | 𐰅 | 𐰃 | 𐰆 | 𐰇 |

**Fonetika**. Yunan-latın hərflərilə yaxınlığı olan etrusk əlifbasında əksər hərflərin hansı səsi bildirməsini müəyən etmək etruskoloqlar üçün o qədər çətin olmamışdır. Belə ki, etrusk yazılarında yunan-latın dillərindən alınmış bəzi sözlərin, yer, şəxs və tanrı adlarını bildirən onomastik sözlərin yazılışında hərflərin səs dəyəri, az da olsa, bir neçə latın-etrusk ikidilli kiçik mətnlərin varlığı etrusk əlifbasının düzgün müəyənləşməsi üçün imkan vermişdir. Doğrudur, artıq etrusk əlifbası əksər tədqiqatçılar üçün mübahisə doğurmayan bir məsələyə çevrilmişdir, lakin bir neçə hərfin hansı səsi bildirməsi hələ dəqiq öyrənilməmişdir. Çünki yunan-latın dillərində olmayan bəzi səslər etrusk dilinin özəlliyini təşkil edir, onların əlifbada hansı hərflər ilə ifadə olunduğunu tapmaq üçün ciddi araşdırmalara ehtiyac vardır. Verilən bu hərflərdən yalnız *s, z* səslərini bildirənlər quşqu doğurmur.




Etrusk dilinin fonemlər sistem sait səsləri bildirən hərflərin doğru müəyən edilməsindən çox asılıdır. Bu nədənlə, etrusk əlifbası ilə eyni qaynaqdan olan göytürk runuk əlifbasında özünü göstərən eyni işarənin, yuxarıda deyildiyi kimi, işləndiyi sözdən asılı olaraq dilarxası və dilönü saiti ifadə etməsi etrusk dilində saitləri bildirən hərflər üçün də keçərli ola bilər.






Uzmanlar müxtəlif sözlərdə işlənən 𐌊, 〉, ϙ hərflərini [k] səsi kimi oxuyurlar. Halbuki, elə etrusk yazıları var ki, bu hərflərin üçü də orada işlənir. Örnəyin;

Bu yazıdan bəlli olur ki, 𐌊 hərfi ***ka*** və ***kak*** hecalarının başında, 〉 hərfi də ikinci hecanın sonunda, ϙ hərfi isə ***qu*** hecasında işlənə bilir:



thuskac
qunumes
kra [kara]

Troya savaşına aid bu şəkildə Aicas [Aykas] ilə Axillesin [Aqle] adı yazılmışdır. Burada 〉[k] və ↓[q] işarələri ***kas*** və ***aq*** hecalarında görünür:




Etrusk yazılarında ↓ hərfi hər yerdə [x] səsi kimi oxunur ki, bu da gerçək durumu əks etdirmir. Doğrudur, həmin hərfin bildirdiyi [q] səsinin fonetik inkişafda [x] səsinə keçməsi azər türkcəsində olduğu kimi (*oq* > *ox*) normal haldır, lakin bu finetik dəyişməni bütün sözlərə şamil etmək doğru deyildir. Eyni yozum 𐌅 hərfi üçün də keçərlidir. Belə ki, etrusk yazılarında bu hərfin yalnız [v, w] səsi, bəzən hətta [f] səsi kimi oxunması da fonetik sistemin inkişafında *g* > *ğ* > *v* dəyişmələrinin gözardı edilməsilə bağlıdır. Səs quruluşu baxımından etrusk dili ilə çuvaş dili arasında bənzərlik vardır. Azər türkcəsindən fərqli olaraq, bu dillərdə samit səslər kar və cingiltili əlamətə görə zəif fərqlənir. Bu baxımdan, p/b, t/d, s/z, x/q səsləri etrusk yazılarında işlənmə yerinə görə fərqli oxuna bilir.

**Orfoqrafiya**. Etrusk mətnlərini oxumaq üçün öncə runik əlifbanın işlənmə özəlliyi, istifadə olunduğu dilin yazı qaydaları tədqiq olunmalıdır. Doğrudur, etruskologiya elminin bu shədə müəyən araşdırmaları, uğurları vardır, lakin etrusk dilinin orfoqrafiyasında hələ cavabını tapmamış xeyli suallar da vardır. Belə suallardan bir-ikisinə burada aydınlıq gətirməyə çalışaq.

Etrusk yazıları ilə məşğul olanlar bilir ki, bu dildə bir sıra sözlərin yazılışı bir-birindən fərqlidir. Bunu aydın görmək üçün bir neçə örnəyə baxmaq kifayət edər:

Troya çarı Priamın oğlu Aleksandrın adı: *Alexsantre, Alcsentre, Alaxsantre, Elaxšntre, Elcsntre, Elxsntre.* Menerva tanrıcanın adı: *Meneruva, Menrva, Menrua, Merva, Mnrva.* Ön Asiya mənşəli Goroqlu (Herakl) adı: *Herecele, Hercle, Xurcles, Kuruqile, Xurxles, Heracle, Herxle.*

Belə yayğın və hamının bildiyi bu adların yazılışında görünən müxtəliflik, təbii ki, o qədər də bilinməyən sadə apelyativ sözlərin yazılışında da vardır:

*apurthe - apurte, aule - afle, mulach - malak - mlach*
*mlacaš - mlakaš - mlaxas, larth - lart, kara - cara*
*kape - cape, zicu - zixu,*

Türk el qurumuna aid olub bir sıra Avrasiya xalqlarının da dilinə keçmiş *tarkan, tarxun* tutulları həm də şəxsadı kimi işlənmişdir. Tarqun (Tarxun) adının etrusk yazılarında belə variantları vardır: *Tarquenna, Tarquinii, Tarxųnies, Tarxun, Tarxunie, Tarxunus*. Etruriyada tapılan yazılarda etruskların hətta öz etnik adı olan *rasena* (aras-ena) etnonimi də *rasna, rašna, rašne, rašneš, rasnea* formalarında yazılmışdır.

Göründüyü kimi, etrusk yazılarında eyni sözün müxtəlif cür yazılışı var və bunların hamısını imla (orfoqrafiya) xətası saymaq olmaz. Belə sözlərin yalnız bir qismi yazarın savadı üzündən yanlış yazıla bilərdi. Əsas səbəbsə etrusk dilinin bir

neçə dialektə ayrılması ilə bağlı idi. Əslində, burada söhbət bir ədəbi dildən (etrusk) ayrı-ayrı dialektlərin yaranmasından deyil, ortaq dili formalaşdıran müxtəlif kökənli boyların dialektlərindən gedir. Deməli, etrusk dilinin açarını tapmaq üçün öncə bu dilin dialektlərini əks etdirən yazıların qruplaşdırılıb sistemə salınması da gərəkir.

Etrisk sözlərində bəzi saitlərin yazılmaması əlifbanın qarışıq - sillabik (hecalı) və fonetik xarakter daşıması ilə bağlıdır. Ona görə, müəyən sözlərdə samitlər, özəlliklə sonor samitlər (r, l, m, n) yazılmayan saitərlərlə heca şəklində oxunanda sözün etrusk dilindəki anlamı türkcə qarşılığı ilə ortaya çıxır.

*lupu* [olupu] “olüb”, *klan* [oklan] “oğlan”,

*rth* [erti] “erti//idi”, *rth* [erat] “ər adı”, *ril* [eril] “ər il”

Göytürk və etrusk yazılarında *a/ə* və *s* kimi oxunan 𐰀, ʃ hərfi hər iki yazıda bəzən sözlər arasında durğu işarəsi (ayırıcı) vəzifəsini daşıyır. Bu halda 𐰀, ʃ durğu işarəsi nöqtə və vergül kimi ayrıca səs bildirmir. Ona görə də belə orfoqrafik qaydaları bilməyən etruskoloqlar, özəlliklə uzman olmayan həvəskar araşdırıcılar bir çox mətnin transkripsiyasını yanlış verir. Örnəyin, lemni yazısında **ssgas : agss** sözlərini P. Kaya ***ssaqas : aqass*** şəklində oxumaq istəmişdir, halbuki həmin deyim (Z) ***sugas*** : ***agıs*** (Z) şəklində oxunmalıdır.

Etruskoloqlar kimi bəzi türkoloqlar da eyni yanlışlığa yol verir. Örnəyin, S.Q. Klyaştornı »Y? ʃ ꟻᴎ⅄ ʃ »Yᛋh yazısında ʃ durğu işarəsini ayrıca söz kimi oxumuşdur: *tanrım a öçük a yerim.*[31]

Bugün soy-şəxs adlarının yazılışında geniş istifadə olunan **M**(irzə) **F**(ətəli) Axundov kimi **qısaltmalar** etrusk çağından işlənir. Etrusk yazılarında, özəlliklə başdaşı epitafiyalarında

---

[31] *Кляшторный,* 1976, 68-69.

yayğın olan bəlli adların, çoxişlənən sözlərin baş hərfi yazılır. Belə qısaltmaların bütöv forması ikidilli yazıda asan bərpa oluna bilir. Örnəyin;

TLE 514.
(latınca): **lart cae caulias**
(etruskca): **l. cae. caulias** (*Lart Kayı Kaulias*)

Bu ikidilli yazıdan öyrənmək olur ki, etrusk variantında yalnız baş hərfi (*l*) yazılan söz *Lart* adı imiş. Deməli, epitafiyalarda rast gəldiyimiz *l* hərfli qısaltma *Lart* kimi oxunur. Etrusk yazılarında qısaltmalar əsasən epitafiyalarda, başdaşı yazılarında özünü göstərir.

**Morfonologiya**. Bir saxa (yakut) məktəbə *uşukula* deyirsə, deməli onun ana dilində rusca *şkola* sözündəki səs düzümü yoxdur. O, tələffüz edə bildiyi vərdişlə bu sözü ana dilində sözlərin səs-heca quruluşuna uyğunlaşdırır, dilcilikdə buna *interferensiya* deyilir. Etrusk dilində alınma sözlərin yazılışı göstərir ki, onlar bəzi yunan-latın sözlərini tələffüz etməkdə çətinlik çəkirmişlər, belə sözləri ana dilinin fonotaktikasına uyğunlaşdırıb deyirmişlər: *Apollon* > *Apulu*.

Etrusk yazılarında fleksiya kimi görünən *usil//uselna* tipli sözlərdə sait əvəzlənmələri vardır. Lakin bilmək olmur ki, burada *i/e* əvəzlənməsi usil sözünə şəkilçi qoşulanda baş verir, yoxsa *usil//usel* fərqi dialekt özəlliyi və ya ayrı nədənlə bağlıdır. Eyni sözü *clan //clenar* kimi a//e əvəzlənməsini əks etdirən örnəklər haqqında da demək olar.

Etruskoloqlar tipoloji baxımdan etrusk dilini aqqlütinativ (bitişkən) saysa da, sözlərin tərkibində görünən səs əvəzlənmələrini flektiv dillərdəki duruma bənzədir və müxtəlif formalı şəkilçılərin eyni qramatik funksiya ilə bir sözdə işlənə bilməsini, belə durumun qoşma və bağlayıcılarda da görünməsini *inflected* və *uninflected* terminlərilə verirlər. Əlbəttə, etrusk dilinin morfonoloji quruluşundan yalnız bu dilin açarı

tapılandan sonra danışmaq olar, çünki sadalanan özəlliklər morfonoloji qaydalar deyil, sadəcə dialekt fərqlərilə də bağlı ola bilər.

Etrusk yazılarında bəzi saitlərin yazılmaması əlifbanın tam fonetik deyil, hecalı (*sillabik*) yazı növü ilə qarışıq bir əlifba olduğunu düşünməyə əsas verir. Bu baxımdan, morfonoloji özəllikləri əks etdirən sillabik yazı qaydalarını dəqiqləşdirməklə etrusk dilinin morfonoloji quruluşunu ortaya çıxarmaq olar.

**Morfologiya**. Etrusk dilinin hansı dil ailəsinə aid olması omun morfoloji quruluşundan asılıdır. Tipoloji baxımdan bu dil birləşik (aqqlütinativ) dillərdəndir, yəni türk dili kimi söz kökünə qoşulan şəkilçilər ona yeni leksik və qramatik məna verir. Belə dillərdə önqoşma olmur. Məsələ burasındadır ki, etrusk yazılarında şəkilçiləri müəyən etmək o qədər də çətin deyil, lakin onların qramatik yükünü, hansı vəzifə daşımasını ayırd etmək çətinlik yaradır. Örnəyin, yazılarda çox işlənən oğlan anlamındakı *clan* sözünə bu şəkilçilər qoşula bilir:

clan [klan] "oqlan"
- iu
- iu-s-a
- iu-š
- ti
- te-š
- in-š-l

Tipoloji baxımdan etrusk dili birləşik (iltisaqi) dil olduğu üçün türk dillərindəki kimi, burada da söz kökünə bir neçə şəkilçinin dalbadal qoşulması doğaldır:

türk: ***göz**-əl-lik-lə*; etrusk: ***larth**-al-iş-la*

Bəzi etruskoloqlar etrusk dilinə hindavropa dillərindən biri kimi baxdığından bu dilin morfologiyasını o dillərin qramatik kateqoriyaları ilə yozmağa çalışırlar. Etrusk dilində olmayan çins bildirən morfemlər axtarır, hətta onların hallanma for-

maların "tapır", bəzi adların sonluğunu isə adlıq hal forması kimi verirlər.

Etrusk dilində isimlərin hallanması haqqında müəyən bilgilər əldə edilmişdir, lakin bu sahədə uğurlar etruskoloqların güman etdiyi qədər də deyil. Hər halda, hələlik uzmanların hallara aid qəbul edib razılaşdığı ortaq fikirləri gözdən keçirəndə etrusk dilində sözlərin hallanması ilə türk dili hallanma sistemi arasında müəyən bənzərlikləri görmək olur.

Türk dilləri kimi etrusk dilində ***adlıq halın*** (*nominativ*) şəkilçisi yoxdur: *apa* (apa, ata), *klan* (oğlan), *spur* (şəhər). Uzmanlar etrusk dilində ***yiyəlik halın*** (*genitiv*) iki cür (*-s//-ş* və *-l*) şəkilçı ilə yarandığını yazırlar: *apa-s* (apa-nın), *spur-al* (şəhər-in), *Laris-al* (Laris-in), *Ramtha-ş* (Ramta-nın).

Etruskologiyada cəmlik şəkilçisilə işlənən yiyəlik halın *-ra-s* (canlı), *-xva-l* (cansız) formalarını qeyd edirlər. Əgər bu yorum doğrudursa, onda türk morfoloji sistemindən kənarda qalan bu qramatik göstəricinin (canlı-cansız) etrusk dilində hansı dilin qalığı olması araşdırılmalıdır. Bəzi uzmanlar *-is, -(a)ls* şəkilçilərini ikiqat yiyəlik (*dubl genitiv*), bəziləri də ***birgəlik halı*** kimi I ablativ, II ablativ adlandırırlar.

M. Pallottinonun etrusk dilində yiyəlik halın iki şəkilçisi olması haqqında yozumunu A. Ayda xanım dolaşıq və yanlış sayır, doğru olaraq, bu şəkilçilərdən birini (*-s*) mənsubiyət bildirən morfem kimi dəyərləndirir və həmin şəkilçiyə aid bu örnəyi verir: [32]

Avileska apas - "*Avileska(nın) apa-sı*"
Avileska-l apas - "*Avileska-nın apa-sı*"

Göründüyü kimi, etrusk dilində yiyəlik, birgəlik halları və mənsubiyət bildirən şəkilçilərin dəqiqləşməsinə ehtiyac vardır. Əvvəla, nəzərə almaq lazımdır ki, aqqlütinativ dillərdə

---

[32] *Ayda,* 1992, 235-236.

olmaması gərəkən erqativ halın etrusk dilində axtarılması əvəzinə bu dildə olması gərəkən ***mənsubiyət*** şəkilçisi tapılmalıdır. Bu axtarışın ipucu söz sırasıdır: təyin olunan sözün sonra gəlməsi, mənsubiyət bildirən şəkilçinin də ona qoşulması diqqqətə alınmalıdır. Bir nəsnənin kimə məxsus olması onun üzərindəki yazıda mənsubiyət göstəricisinin işlənməsi ilə bəlirlənir. Örnəyin, "Mən Mamerkenin artesiyəm (sancağıyam)" deyimi olan bu yazıda (TLE 338) mənsubiyət bildirən *-si* morfemi belə verilmişdir:

mi mamerces arte-si (*mən mamerke-nin arte-si*)

Etrusk dilində ***təsirlik halı*** (*akkuzativ*) qıpçaq qrupu türk dillərində (*ev-ni*) olduğu kimi *-ni* şəkilçisilə bildirilir. Bunu I şəxsin təkini bildirən *mi* (mən) əvəzliyi aydın sərgiləyir: *mi-ni* (məni). Həmin formada şəkilçi samitlə bitən sözlərə də qoşulur: *spur-ni* (şəhər-ni). Azər türkcəsində isə *-ni* şıkilçisi saitlə bitən sözə qoşulur: *evi-ni, quyu-nu.* Bəzi etrusk yazılarında *mini* ilə yanaşı *mine//mene* sözlərində də təsirlik halın morfemi (*-ne*) olduğunu söyləyirlər. Bununsa doğru olub-olmadığını mətn daxilində yoxlamaq gərəkir.

M.Pallottino əski etrusk yazılarında ***yönlük hal*** (*dative*) şəkilçisinin *-a* formantı ilə bildirildiyini qeyd edir.[33] Türk dillərində həmin şəkilçinin *-a//-ə, -qa//-gə* kimi bir neçə fonetik variantı vardır.

Etrusk dilində ***yerlik halın*** (lokativ) *-thi//- ti* şəkilçisilə işlənməsi söylənir: *spur-ti* (şəhər-də), *klan-ti* (oğlanda). Bəzi türk dillərində bu morfemin *-te* variantı etrusk deyiminə çox yaxındır: *el-te* (eldə).

Bəllidir ki, türk dillərində ***cəmlik*** bildirən *-lar* şəkilçisi topluluq bildirən *-la, -ar* şəkilçilərinin (la+ar= lar) qovuşması ilə yaranmışdır. Vaxtilə həmin *-ar* morfeminin türk və etrusk

---

[33] *Pallottino,* 1975, 215.

dillərində cəmlik bildirən eyni şəkilçi olduğunu göstərmişdik.[34] Bəzi uzmanlar *-r* şəkilçisini canlı, *-xva//-cva//-va//-ua* şəkilçilərini isə cansız məfumlar bildirən sözlərə qoşulduğunu söyləyirlər: *ais* (tanrı), *ais-er* (tanrılar); *marunu-xva* (marunular).

Beləliklə, etrusk və türk dillərində hal və kəmiyyət göstəricilərinin bu qısa və ötəri müqayisəsi də göstərir ki, əlifbada olduğu kimi, qramatik qatda da bu dillərin ortaq elementləri vardır. Örnəyin, hər iki dildə eyni anlamı olan *apa* sözünün hal və mənsubiyət şıkilçilərilə işlənməsini belə vermək olar:

| **İsmin halları** | **tək və cəmdə** | **türkcəsi** |
|---|---|---|
| adlıq (nominativ) | *apa* | *apa* |
| | **apa-(a)**r*** | *apa-(la)**r*** |
| yiyəlik (genitiv) | **apa-(a)**l*** | *apa-(n)**ın*** |
| | **apa-**r-al*** | *apa-**lar-ın*** |
| təsirlik (akkuzativ) | **apa-**ni*** | *apa-**nı*** |
| | **apa-**r-ni*** | *apa-**lar-nı*** |
| yönlük (dative) | **apa-**a*** | *apa-(g)**a**//-(y)**a*** |
| | **apa-**r-a*** | *apa-**lar-a*** |
| yerlik (locativ) | **apa-**ti*** | *apa-**ta*** |
| | **apa-**r-ti*** | *apa-**lar-ta*** |
| çıxışlıq | ? | *apa-tan* |
| | | *apalar-tan* |
| birgəlik (ablativ) | ? | *apa-(y)nan//la* |
| | | *apalar-nan//la* |
| **Mənsubiyət** | **apa-s(i)* | *apa-**sı*** |
| | **apa-**r-si*** | *apa-**lar**-(*s)**ı*** |

Etrusk dilində ***əvəzlik*** kimi işlənən sözlərin olmasına heç kim şübhə etmir, lakin bunların şəxs, işarə, sual əvəzlikləri üzrə müəyənləşdirilməsi hələlik tam başa çatmayıb. Bəzi işarə əvəzliklərinin fonetik dəyişmələrə uğraması söylənir: *ita*

[34] *Ağasıoğlu,* 1988, 195.

> *eta* > *ta*, *ika* > *eca* >*ca*. I, III şəxs əvəzliyini bildirən sözlər və bəzi işarə əvəzlikləri etrusk və türk dillərində oxşardır:

| **şəxs əvəzliyi** | **etrusk** | **türk** |
|---|---|---|
| I | mi | mən |
| II | ? | sən |
| III | an | an, o |
| | vil | ol, vil (*çuvaş*) |
| **işarə əvəzliyi** | pi, pul | bu(l) |
| | an, in | an, in, ol |

Etrusk dilində qoşma, bağlayıcı, ədat, inkarlıq morfemi bəlirlənməyib. Bəsit sintaktik quruluşlu bu dildə önqoşma, cins kateqoriyası yoxdur. Köməkçi feillər, feilin zaman, növ formaları hələlik o qədər də aydın deyil. Uzmanlar keçmiş zamanı bildirən *-ce* (*-ke*) şəkilçisini göstərirlər:

sval-ce (sğalke) - *yaşadı, sağaldı*

lupu-ce (lupuke) - *öldü, ölübdü*

muluvani-ce (muluvanike) - *yapdı, qayırdı*

Beləliklə, etrusk dilinin müxtəlif qatlarına ötəri baxış bir daha bu dilin qarışıq olduğunu, burada türk dili ilə yanaşı başqa bir (və ya iki) dilin özəlliklərinin də yer aldığını göstərir. Etrusk əlifbası göytürk əlifbası ilə eyni mənşəlidir və bu dil fonetik, leksik, bəzi qramatik göstəricilərə görə çuvaş dilinə yaxındır. Tipoloji baxımdan da birləşik (aqqlütinativ) dillər qrupunda olan etrusk dili ilə türk dilləri arsındakı bağlantı 3 minil öncəyə dayanır. Birləşik dillərin morfonoloji quruluşundakı konservatizm etrusk-türk əlaqələrinin ortaya çıxarılmasına imkan verir və bu imkan etrusk dilinin daxili dialekt özəllikləri öyrənildikcə daha da artacaqdır. Bunun üçün ilk növbədə etrusk yazılarının bölgələr üzrə, həm də mövzulara görə qruplaşdırılması gərəkir.

## ETRUSK YAZI ÖRNƏKLƏRI

Yazıları forma və məzmununa görə qruplaşdırıb gözdən keçirmək, onların transkripsiya və oxunuşlarını vermək daha faydalı olardı, lakin bunun üçün ayrıca araşdırma aparmaq lazımdır. Burada isə məqsəd etrusk yazıları haqqında ümumi bilgi verməkdir.

Britaniya muzeyində saxlanan metal lövhə (Tavola Oska) üzərində 42 sətirlik etrusk yazısı vardır. Yazının 25 sətiri lövhənin ön tərəfində, qalanı isə arxa tərəfindədir. Tavola Oska yazısında iki dəfə keçən Koroğlu adının *Hereklu* şəklində verilməsi də diqqəti çəkir. Sonrakı bölmələrdə bu ad üzərində geniş dayanacağımız üçün həmin yazılış formasını burada ayrıca qeyd etmək lazım gəlir. Yazının bir şeir, yoxsa dini törəndə oxunan öygü və ya dua olmasını bilməsək də, misralar arası və misra sonu qafiyələr bu yazının poetik bir janrda yazıldığını aydın göstərir. Örnək üçün ön və arxa tərəfdəki yazıdan beşər misraya baxmaq olar:

*Di ukey kede hasıuy (s) tatıb*
*Di ukey erega turey (s) tatıb*
***Hereklui*** *kerrı yuy (ss) tatıb*
*Patanay piysti ay (s) tatıb*
*Dey kay gene tay (s) tatıb*

*Di ukey (s) ere hasıu*
*Di ukey piyh yuy erega turey*
***Hereklui*** *kerrı yuy*
*Patanay piysti ay*
*Dey kay gene tay*



HEREKLU - 𐌇𐌄𐌓𐌄𐌊𐌋𐌖

Etruskların *Kurtun* dediyi qədim şəhərdə arxeoloqların 1992-də tapdığı m.ö. III-II əsrə aid metal lövhələr üzərində 40 sətirlik yazı *Tabula Kortona* adı ilə bəllidir. Yalnız 7 il sonra nəşr olunan bu yazının sonluğu itsə də, bütöv mətnin daşınmaz əmlak hüququ ilə bağlı olması söylənir.




Yazının 40-cı sətiri **pitlnal** şəklində yazılmış sözlə bitir və uzmanlar bu sözü şəxsadı kimi (*Petelina*) verirlər. Məncə, Tabula Kortona yazısının son sözü türk bəngüdaş yazılarının sonlugu ilə (*bitdi, bitidim*) uyğundur. Onun yazılışında ilk ***l*** hərfi də daha çox ***i*** hərfinə yaxındır və hər iki halda oxunuşu belədir: p i t i n a l, p i t i l n a l.

Peruciyə yaxın San-Marko adlı təpədə 1822-də tapılan bir yazılıdaş üzərində 46 sətirlik yazı vardır. İndi Peruci arxeoloji muzeyində saxlanan yazılıdaş m.ö. III-II əsrə aid edilir. Çox aydın yazılmasına baxmayaraq üzərindəki yazı bugünəcən oxunmamışdır. Bəziləri bu yazılıdaşın iki etrusk ailəsi

arasında alqı-satqı qonusunda hüquqi sənəd olması, bəziləri də basırıqda yerə dikilmiş başdaşı (bəngüdaş) olması fikrini söyləmişlər. Lakin mətndə işlənən sözlər onun toplantı yeri və ya tapınaqla ilgili olmasına işarə edir. Yazının tam görüntüsü əlimizdə olmadığından uzmanların verdiyi transkripsiyanı yoxlamaq imkanı olmadı. Ona görə də örnək üçün yalnız ikinci abzasın transkripsiyasını veririk:

***avlesi velthina (gelthina). sarznal kl ensi. thip. thilskuna. kenu. eplk. belik larthal sapunes kle. nthun qulthe***



**Güzgü yazıları**. Ən rahat oxuna bilən etrusk yazılarının çoxu güzgü üzərində yazılanlardır. Belə ki, güzgülərin arxasında olan yazılar orada çəkilmiş şəkillərdəki bəlli süjet və obrazlara aid olur. Bunların xeyli hissəsi yunan qaynaqlarından bildiyimiz Troya savasındakı olaylarla bağlıdır. Güzgü

yazıları həm etrusk əlifbası, orfoqrafiyası, həm də etrusk dilinin öyrənilməsi üçün gərəkli material verir. Belə yazılarda öncədən bəlli olan adların yazılış formaları da diqqəti çəkir.

Bu etrusk güzgüsündə olan yazını A. İ. Nemirovski belə verir: *Tarxunas, Pava Tarxies, Veltune, Rathlth.*[35] Başqa etruskoloqlar kimi yazar burada yalnız şəxsadları yazıldığını düşünür. Halbuki burada adlar cümlə daxilindədir. Atların başından aşağı, baxıcının başı üzərində *pava tarqias* (bağa-targias) və güzgünün çevrəsindəsə dairəvi yazıda ***veltune uvernvi avle tarqunus rthlth*** sözləri vardır. Son sözdə buraxılan saitləri yerinə qoyub, yazını g/v fərqilə belə transkripsiya etmək olur: **PAGA TARQIAS VELTUNE (GELTUNE) UGERNGI AGLE TARQUNUS ARATHILTH**




Bu yazını güzgüdə təvsir olunan səhnəyə uyğun oxusaq, bizcə, burada etruskların milli tanrısı Veltune tapınağının gənc haruspiki Bağa Targiasın bağır (ciyər) üzərində baxıcılıq edib verdiyi yoruma daha təcrübəli Agle Tarqunus düzəliş edir:

**Paga Tarqias Veltune ugerngi Aqle Tarqunus arıtılt**
(*Bağa Targias Veltune oxuduğunu Aqle Tarqun arıtladı*)

---

[35] *Немировский*, 1983, 213-214.







Adlar bəzi güzgülərdə yunan-latın yazısında olduğu kimi soldan sağa yazılırdı. Bu güzgüdə isə *Klupumika* ilə *Uruste* adları başayaq yazılmışdır. Ona görə də belə adların oxunuşu özəl diqqət tələb edir.







Ermitaj muzeyində saxlanan m.ö. IV əsrə aid bir güzgünün üzərində lazlarla (mələklərlə) əhatə olunmuş Turanla Atunisin sevişmə səhnəsi təsvir edilmişdir. Turanın atributu sayılan, burada adı tusna (turna) şəklində yazılmış durna şəkili də vardır.

Nyu-York Metropoliten muzeyində saxlanan etrusk güzgüsündəki kimi bəzi güzgülərdə adlar aydın göründüyündən asanlıqla oxunur. Çərçivənin üst tərəfində sağdan sola yazılmış **NEPLE, ELİNEİ, URSTE, THETHİS, AQLE** adları burada aydın görünür:



Uzmanlar burada təsvir olunmuş personajı da çətinlik çəkmədən tanıyır, onların yunan-latın deyimini bərpa edə bilirlər:

*Neoptolemus* (Neple), *Helen* (Elinei), *Orestes* (Urste), *Thetis* (Thethis), *Axilles* (Aqle).

Etrusk yazılarına müxtəıif heykəllər üzərində də rast gəlmək olur. Etrusklardan qalma heykəllər sırasında mükəmməlliyilə seçilən və *meteliş, orator* epitetilə tanınan m.ö. II əsrə aid heykəlin ətəyində sağdan sola yazılmış belə bir mətn vardır:







Etruskoloji ədəbiyatda buradakı yazı adətən *m/ş, v/g, q/x* kimi fərqli oxunan hərflər nəzərə alınaraq iki-üç variantda transkripsiya olunur:




1) *auleşi meteliş ve vesial clenşi cen flereş tece sanşl tenine tuthineş xisvlicm*

2) *avleşi meteliş ge geşial plensi ken bleres teke sanşl tenine tuthineş qısglıkş (və ya 41, 49, 51 sğlıkş)*

3) *avleşi meteliş ge geşial pilensi ken bileres teke sanşıl tenine tutineş qısglıkş*

Tanrı Marisin 520-də hazırlanmış tunc heykəlinin ayağındasa bu sözlər yazılmışdır: THUCER HERMENAS TURUCE (*Tuker Hermenin sunağı*)




Kortona muzeyində saxlanan m.ö.III əsrə aid bu tunc heykəlin budunda yuxarıdan aşağıya belə sözlər yazılmışdır: **v. cvinti. arntiaş. culşanşl alpan. turce.**

Larisa Bonfante buradakı yazının bu anlamda tərcümə olunduğunu qeyd edir: "V[elia] Cuinti, Arnt`s (daughter) to Culśanś (this object) gladly gave".

Yazıda keçən *köl-san* (adlı-sanlı), *alpan, turke* (sunaq) sözlərini diqqətə alaraq bütöv yazını belə oxumaq olar:

V(el) Kvinti Arntiaş kulşanşl alpan turke (*O, Kvinti Arntinin köl-sanlı alpan sunağı*).



Üzərində yazı olan kiçik heykəlciklərdən biri də başında türk (qırğız-qazax) qadınlarının *saukele* adlanan başörtüyünə bənzər papağı olan kahin və ya tanrı fiqurudur. Onun paltarında sol ayağı boyunça tanrıadı (Tin) ilə başlanan yazı var: **tn. turce gel. sgeitus.**

Göründüyü kimi, burada etruskca "yaşam" (sgal//sval) sözünə yaxın *sgeitus* sözü keçir. Əgər bu yozum doğrudursa, onda sağlıq ilə bağlı Tinə xitab olunur: *Tin turke gel sağeytus.*

Etrusk yazılarının çoxu basırıqlarda daş qutular (sarkofaq), külqabılar və başdaşları üzərində epitafiyalardır. Bunların sırasında yas törənilə bağlı deyimlər və sadəcə, ölənin adı, soyadı və yaşı haqqında bu sarkofaq üzərindəki yazıda olguğu kimi yazılar vardır:




**Larke Tutnaş Lathalisa skl abra**

Başqa bir daş qutu üzərində m.ö. III-II əsrə aid yazı:





Bu epitafiyada belə deyilir:

**arnt hele herinial**

(*Arnt Hele herinalı*)

Tarquinada bir basırıq yazısında verilən mətndə "*Anina Arnt velu Tanqvilu atial il 39*" deyimi belə verilmlşdir: **anina** (s) **arnth velu** (s) **thanqvilu** (s) **atial avil** (s) **XXXIX**.



Tarquinada "Anina" basırığı

Buradakı epitafiyada isə belə yazılmışdır: **(t)ana vipinei ranatunia** (Tana Vipinei Ranatunia). Bu daş qutunun bir xanıma aid olduğunu nəzərə alsaq, ***th*** hərfini *ath* (ad) kimi də oxumaq olar: *Ad, Ana Vipiney Ranatunya.*



Etrusk basırıq külqabı, m.ö.II əsr

Bir başqa daş qutunun üzərində epitafiya belədir: [36]

**AR : NAFLIS: CAINA Le:** şəklində oxunmuş buradakı yazını belə oxumaq olur: **ath: naglis kayınal** (*Adı. Naglis Kayılı*).



[36] Script NC (photo www. bstorage.com).

Bizim *Bəsti* qadın adına oxşar *Bastia* adlı bir xanımın daş qutusu üzərindəki yazını belə oxumuşlar:[37]



**VASTIA (8ASTIA) FELSI: LARS̲ (or LARI) LEFVS (or LEFES)**

Yazı pozuq görünsə də, onun transkripsiyası ***Bastia Velsi : larzl evus*** kimi verilə bilər. Bu *Bastia* adı başqa bir etrusk yazısında da (ETP.306) qarşımıza çıxır: ***mi bastial vestrknal***



Avlə Beluskeş bəngüdaşı



avleş beluskeş
tuşnu taş panalaş
mini muluvanike
hirum ... aqer s
nalsam

Kaeradakı daş üzərində yazılmış bu mətndə keçən ***larisal klenar sğal*** (*yaşayan Laris oğlanları*), ***suthi*** (məzarı) kimi sözlər həmin daşın qoyulduğu yerin Larisoğulları üçün basırıq yeri kimi ayrılmasına işarə edir.

[37] Museum Fine Arts. Boston: http://www.mfa.org.

Daş üzərində yazı. Kaera, m.ö.IV əsr



laris . agle :
larisal . clenar sgal . cn .
suthi ceriqunce apac .
atic . sanis ga thui .
cesu clag tie thurasi .



Başqa bir daş qutu üzərində isə bu sözlər yazılmışdır: **laris vel kazna mini muluvanike menervas.**

Daş qutu üzərində yazı





laris vel kazna
mini muluvanike
menervas

Başdaşı yazılarının əksərində ölənin yalnız adı və soyadı qeyd olunur. Belə epitafiyalar adətən ***th, ath, arth*** hərflərilə başlanır ki, bunun qədim türk epitafiyalarında olduğu kimi ***ad, ər ad*** olacağını düşünmək olar. Bu baxımdan, bəzi yazıların başında gələn ***arnth*** sözünü də ***ərən ad*** kimi yozmaq mümkündür. Örnəyin,

ETP 236: **ath : sethrna : cracias** (*Ad Seturna Kraki-as*)

ETP 237: **ath : sethrna : clanti** (*Ad Seturna oqlanti*)

ETP 313: **arnth · vipina · cuφre** (*Ərən ad Vipina Kubre*)

Bəzi başdaşı yazıları bütöv cümlə şəklində olur. Örməyin, m.ö.VI əsrin sonuna aid epitafiya (ETP 333) belə yazılmışdır: **larth laucies thamequ larecesi ka iserithesi celeniarasi mini zinece vethur kam artethi** (*Ol əradla ukies tama qulare keşika içeritesi keleni arasi, məni ineke getur, kam ar tedi*).

Başdaşı yazılarında ölənin yaşı ***avil*** (*yıl*) sözü və bugün rum rəqəmləri dediyimiz etrusk rəqəmləri ilə qeyd olunur. Örnəyin, (Ta1.20-21):

**pinies. laris. lartal apunal-k avil-s XIX**
(Pinies. Laris. Lartal Apunal-k, ili 19)

**pinies. vel lartal apunal tanqvil-us clan avil-s XXX**
(Pinies. O, Lart Apunal Tanqvil oğlu, ili 30)

Bəzi qab-qacaq, nəsnələr üzərindəki yazı ***mi*** (*mən*), ***mini*** (*məni*) əvəzliyilə başlanır və yazılı nəsnənin kimə məxsus olması, kim tərəfindən yapılması və ya kimə sunulması bildirilir. Bu tür yazılara başdaşı üzərində də rast gəlmək olur:

TLE 247: **mi larises telathuras suthi** (*Mən - Laris Teletura qəbri*)

TLE 154: **mi lartha** (*Mən Lartınam*)

ETP 341: **mi cailes cutus** (*Mən - Kaylenin qutusu*)

TLE 338: **mi mamerces: artesi** (*Mən Mamerkenin artesiyəm*)

TLE 35: **mini muluvanece Avile Vipiiennas** (*Məni ərmağan etdi Avile Vibiyenna* )

**İkidilli yazılar** (bilingva). Etrusk dili sirrinin açılmasında ikidilli yazıların əhəmiyəti böyükdür. Belə yazıların sayı isə azdır. Azsaylı sözləri olan ikidilli yazılarda daha çox şəxsin adı, soyadı və əvəzlik işlənir. Əsasən etrusk-latın dillərində olan ikidilli yazılar m.ö. II-I əsrlərə aiddir ki, bu da etrusk dilinin artıq əriməyə başladığı çağlardır. Klusium bölgəsində basırıqlarda tapılan lövhələrin yazıları bunu aydın göstərir.

TLE 521: Etrusk: **arth canzna varnalisla**

Latın: **c. caesius c. f. varia nat**

Göründüyü kimi, etrusk variantından fərqli yazılan latın variantında *caesius* sözü və iki qısaltma *c.* hərfi vardır. Qısaltmalardan biri *canzna* sözünü əvəz edirsə, o biri də bəlli *cae* (kayı) soyadı olmalıdır. Bu halda yazının etruskca bütöv variantı belə bərpa oluna bilər: **arth. cae canzna caesi varnalisla** *Əradı: Kayı Kanzı varnalı kayısı* (soyundan).

TLE 661: Etrusk: **vel . canzi . c. clan**

Latın: **c. cassius c. f. saturninus**

Bu yazının da latın variantında *cassius, saturninus* sözləri əlavə olunmuş, qısaltma ilə verilən *c(aius)* sözü *vel* sözünü (III şəxs əvəzliyi *ol, o*) əvəz etmişdir. Bu baxımdan, etruskcanın tam variantını belə bərpa etmək olur:

**vel (=cae). cassi. canzi cae. clan**

*O (Kayı), Kassi Kanzi Kayı Saturnın oğlu*

Adriatik dənizi yaxınlığında Pezaro (qədim Pisarium) basırığında tapılan daşın üzərində m.ö. I əsrə aid yazının ilk iki sırası latınca, üçüncüsü isə etruskcadır.

TLE 697: Latın: **[l.ca]fatius. l. f. ste. haruspe[x] fulguriator**

Etrusk: **cafates. lr. lr. nets'vis. trutnut. frontac**



Pezaro yazısı

Hər iki sətirdəki qısaltmaları tam yazanda təxminən bu oxunuş alınır: *Laris Kavat uluq* (lucius) *Laris oğlu, Stellatinli baxıcı* (haruspek, turutrnut) *falçı-qam* (fulguriator, burontaq).

II BÖLÜM

# ETRUSKLARIN SOYKÖKÜ

XIX əsrdə Etruskların mənşəyi problemi qabarıq şəkildə gündəmə gəldi, çünki bu dönəmdə hindavropa dilli xalqların vahid dil ailəsinə mənsub olması yeni yaranmış tarixi-müqayisəli diçilik elmilə sübut olunmuşdu. Avropa mədəniyətinin kökündə duran etrusklarin dili isə bu ailəyə girmirdi. Buna görə, etrusk sorununu çözmək istəyi aktuallaşmışdı. Həllini gözləyən məsələlərsə etruskların mənşəyi və etrusk yazılarını oxumaq idi.

Etruskologiyada daban-dabana zidd yorumlar nəticəsində etruskların dili kimi, soykökü də çözülməz hala gəlmişdir. Ancaq ziddiyətli yorumlar arasında gerçək durumun çözümünə yardım edən fikirlər də vardır. Hələ XIX əsrdə Corc Dennis etruskları *qarışıq etnos* kimi öyrənməyin əhəmiyətli olacağını qeyd etmiş, ən azından yerli uruqlarla qaynayıb-qarışmasının quşqu yaratmadığını söyləmişdir. Etruskların soykökü probleminə bu yanaşma doğrudur, çünki etruskca yazılmış mətnlərin qramer özəlliyi də qarışıq dil elementləri ilə diqqəti çəkir. Belə qarışmanın etrusklar hələ Anadoluda ikən başlandığını düşünə bildiyimiz kimi, onların İtaliyaya köçündən sonra gerçəkləşə biləcəyini gözardı etmək olmaz.

Apennin yarımadasında m.ö. XIII əsrdə ölübasdırma adətinin ölüyandırma (kremasiya) ilə əvəz olunması göstərir ki, bu basırıq kulturunu daşıyan quzey boyları artıq gəlib İtaliyada məskunlaşmışdı. Orta Avropadan gəlib burada yerləşən həmin boylar torpaq və ağacdan düzəltdikləri alaçıqlarda yaşayırdı. Əsasən əkinçiliklə barınan *Villanova kulturu* daşıyıcıları olan boylardan qalmış arxeoloji bəlgələr aydın göstərir ki, onlar metalişləmə ilə də tanış idilər. Villanovalılar

ölənin külünü adi görünüşlü, antropomorf və evəbənzər qaba yığıb basırığa qoyurdular. Etrusklar gələndən sonra da bu gələnək kurqan və katakomb basırıqlarla yanaşı davam etmişdir.

Bir xalqın kultur sahələrilə onun etnik soykökünü təyin etmək bir sıra çətinliklərlə bağlıdır. Özəlliklə, bir bölgənin regional kultur dəyərlərini uzaqda yerləşən başqa bölgəyə daşıyan bir xalqın yeni yurdda sərgilədiyi kultur göstəricilər burada mövcud olan yerli və qonşu xalqların kulturu ilə birgə inkişaf edir. Əslində, etruskların taleyini yaşamış xalqlarda olduğu kimi etrusk mədəniyəti superetnik kulturlarla yoğrulmuşdur. Ön Asiya kulturu ilə yerli Villanova kulturu sintezindən yaranan etrusk kulturu həm də kənardan İtaliyaya gəlib kaloniyalar halında yaşayan yunanlara məxsus kulturun təsirinə uğramışdır. Bu baxımdan, etruskların kimliyini aca biləcək ipucunu kultur sahələrdə bulmaq o qədər də asan deyil, burada yararlı bəlgəni yalnız dolayı yolla əldə etmək olur.

Özlərini *raśna, rasenna* adlandıran etruskların adı latınca *etrusci*, italiyanca *etruschi*, *tusci*, yunanca *τυρσηνοί, τυρρηνοί* şəklində yazılırdı. Bəzi uzmanlar tirrenlərin İtaliyada yerləşməsini Roma şəhərinin salınmasından 290 il öncəyə bağlayır, bəziləri də Etruriyadakı arxeoloji bəlgələrə görə bu tarixi 8-7-ci əsrlərə aid edir. İlk baxışda bu fikirlər arasında ziddiyət görünür, ancaq İtaliyaya quzeydən və doğudan olan köçləri, hətta Anadoludan olan köçün birdəfəlik deyil, dalğalarla, ən azı iki müxtəlif çağda baş verdiyini düşünsək, onda ziddiyət aradan qalxar.

Hələ ki, etriskların hansı qədim xalqa bağlı olması, İtaliya torpağına haçan və haradan gəlməsi haqqında irəli sürülən fərqli hipotezlərin heç biri gündəmdən çıxmayıb, 25 əsr öncə söylənən fərqli fikirlər, yorumlar azalmaqdansa, son illər daha da artmışdır. Vaxtilə Herodot yazırdı ki, sonralar *tirsen*

adı ilə tanınan etrusklar öncə Anadolunun Lidiya bölgəsində yaşayırmış. Burada quraqlıq nədəniylə başlanan qıtlıq üzündən elbəy *Atis Manes* oğlu xalqı iki qrupa ayırıb püşk atır: burada qalası toplumun başında özü qalır, gedəsi qrupa isə oğlu *Tirseni* başçı qoyur.

Tirsenlə bərabər ölkəni tək edənlər Smirna (İzmir) limanından gəmilərə minib yeni yurd yeri axtara-axtara İtaliyaya yan alırlar. Yarımadanın orta yaxalarına çıxan miqrantlar bu ərazilərdə *tirsen* adı ilə yerləşir və orta bölgələrə yayılırlar. Tit Liviy ilə Polibiy də bu fikri savunurdular. Bu yoruma həmin çağlarda dəstək verən başqa yazarlar olsa da, m.ö. I əsrdə Romada yaşayan Halikarnaslı Dionisiy əks fikir söyləyirdi. Yazar etruskları (tuskları) İtaliyaya gəlmə xalq deyil, yerli xalq sayır, onların lidiyalılarla ortaq tanrıları, ortaq dili, oxşar gələnək-görənəkləri olmadığını yazırdı. Dionisiy Herodotun çağdaşı, lidiyalılar haqqında kitab yazmış Ksanfın da etruskların Lidiyadan köçməsi haqqında heç nə demədiyini, Atis oğlunu *Tirsen* deyil, *Toreb* adlandırdığını xatırladır. Ancaq bunu da qeyd edək ki, Toreb (Turab) adına bənzəyən *Turebi* (TLE. 541) adı etrusklar içində də vardı.

Bəzi yazarlar *Lidiya* adını burada hökmdar olmuş Lidusun adı ilə bağlayır, bəziləri də öncə bu ölkənin *Ludya* və yaxud *Meonya* adlandığını deyir. Hər halda burada lidiya adlı xalq və ayrıca lidiya dili olmamışdır. Öncə hindavropa dilli iyonların, sonralar da türkdilli qamərlərin (kimerlərin) istilasına uğrayan Lidiya bölgəsindən İtaliyaya köçənlərin kimliyini dil bəlgəsi olmadan müəyən etmək çətindir. Əslində, Lidiya adı sonrakı mərhələyə aiddir, tirrenlərin köçü dönəmindən sonrakı addır.

Etruskların doğudan gəlməsi və ya yerli xalq olması fikrilə yanaşı, onların İtaliyaya quzeydən gəlməsini söyləyənlər də vardır. Tit Liviy yazır ki, alp boyları, özəlliklə retilər etrusk

kökənli idi və onlar dağlarda qaldığı üçün yabanılaşıb əski gələnəklərini unutdular, dilləri də pozuldu. Bəzi çağdaş uzmanlar da etruskların quzeydəki Reti bölgəsinindən keçərək İtaliyaya gəldiyini söyləyirlər. Bu üçüncü konsepsiya XVIII əsrdə N. Frere tərəfindən gündəmə gətirilsə də, davamçıları bugün də vardır.

İkiçayarasının (Mesopotamiyanın) quzey, Anadolunun batı bölgələri ilə Etrusk abidələrı, əkinçilik kulturu arasında oxşarlıq vardır. Anadoludakı Toprak-qala yaşayış məskəni ilə Etruriya arasındakı yaxınlığı da diqqətə alan A. Piqanoli etruskların doğudan gəlməsi fikrinə üstünlük verir. Vizner də etruskların Qafqaz-Azərbaycan sınırlarından çıxdığını irəli sürmüşdü, lakin onun fikrincə onlar birbaşa Anadolu üzərindən deyil, Qaradəniz üzərindən dolanıb, Frakiyanı, İlliriyanı keçıb İtaliyaya gəlmişlər. Mario Alineyinin yeni teoriyası da macar kökənli etruskların quzeydən gəlməsi üzərindı qurulmuşdur.

Son vaxtlar DNA üzrə aparılan tədqiqatlarda etruskların Anadolunun batı sakinləri və qədim Troya bölgəsilə yaxınlığı aşkar olmuşdur. İtaliya genetikləri təkcə adamların deyil, heyvanların da (*Bos taurus*) DNA-sı üzərində araşdırma aparıb eyni nəticəni almışlar.

Marko Pellekianın (*Marco Pellecchia*) başçılığı ilə araşdırma aparan uzmanlar Toskan və Anadolu qaramalı arasında mitoxondrial göstəricisinin (mtDNA) 60% eyni olduğunu müəyən etmişlər.[38] Beləliklə, m.ö.V əsrdə Herodotun yazdığı və Fukidit ilə Senekanın da dəstəklədiyi versiya - etruskların Anadoludan gəlməsi fikri təsdiq olundu. DNA üzrə araşdırmalar bir neçə dəfə təkrar edilmişdir.

---

[38] "Proceedings of the Royal Society B: Biological Sciences" jurnalındakı bildiri: *The mystery of Etruscan origins: novel clues from Bos taurus mitochondrial DNA.*

İtaliyada bir neçə universitetin genetika uzmanlarından oluşan grup tərəfindən 2004-də etruskların soykökü üzərində aparılan tədqiqat yönündə m.ö.VII-III əsrlərə aid 80 skeletdən alınan DNA örnəkləri ayrı-ayrı xalqların DNA-sı ilə müqayisə edilmişdir. Alınan sonuçla etruskların genetik baxımdan ən çox Anadolu türklərinə yaxın olması ortaya çıxmışdır.[39] Çağdaş insanlar üzərində aparılan tədqiqat da eyni nəticəni vermişdir. Torino universitetinin professoru Alberto Piazza bildirib ki, Toskana ərazisində etruskların yaşadığı Volterra, Murlo və Kasentino qəsəbələrində ən azı üç nəsil yaşayan 263 nəfərdən götürülən qan nümunələrinin DNA testləri İtaliyanın quzey və güneyində, Güney Balkan bölgələri, Sardinya, Sicilya, Lemnos adaları və Anadolunun keçmiş Lidiya torpaqlarında yaşayan 1264 nəfərin DNA testilə müqayisə edilmiş, yenə də genetik yaxınlığı Türkiyədən alınan nümunələr göstərmişdir. Beləliklə, Torino universitetinin sınaqları daha öncə Ferrara universitetindəki elmi sınaqlarda alınan nəticəni təsdiq etmişdir.

Etruriyadakı tarixi-etnoqrafik bəlgələr göstərir ki, buraya gələn etrusklar yerli kulturu məhv etməmişdir. Əksinə, ortaq mədəniyətin formalaşmasına təkan vermişdir. Belə ki, gəlişmiş Ön Asiya kulturunu gətirən boylar buradakı bəsit yerli kulturun inkişafına səbəb olmiş, gəlmə-yerli kulturlarım sintezindən superetnik etrusk kulturu yaranmışdır. Özəlliklə, basırıq gələnəyində yerli və gəlmə kulturun yanaşı davam etməsi aydın seçilir; bir tərəfdən kurqan və kurqanaltı otaq gələnəyi, digər tərəfdən yandırılan ölülərin külünü saxlamaq üçün istifadə olunan fiqurlu qablar iki basırıq kulturunu sərgiləyir. Mifologiya sahəsində də gəlmə-yerli motivlər, tanrı adları seçilir.

---

[39] *American Journal Hum Genetics,* 2004, cild 74, səh. 694.

Beləliklə, etruskların kökü haqqındakı fikirləri üç qrupa ayırmaq olar: 1) etrusklar İtaliyanın yerli xalqıdır; 2) etrusklar İtaliyaya quzeydən gəlmişlər; 3) etrusklar İtaliyaya doğudan, Anadoludan gəlmişlər. İrəli sürülən bu hipotezlərin heç biri hələlik tam təsdiqini tapmamışdır. Etruskların yerli və ya gəlmə xalq olması probleminin çözümü etrusk dilinin açılmasndan, bu dilin hansı dil ailəsinə mənsub olması sualına cavab tapılmasından asılıdır.

**1. Etruskların pelask sayılması.**

İlk dəfə Homer pelasqları Kritdə yaşayan xalqlar sırasında qeyd edir, həm də onları Troya savaşında troyalıların yandaşı kimi verir.[40] Antik çağ tarixçilərinin (Fukidid, Herodot, Ksenefon və b.) verdiyi məlumata görə, yunanlılar Yunanıstana gələndə burada hindavropa uruqları ilə yanaşı pelasqlar da yaşayırmış. Tarixi qaynaqlarda pelasq boyunun *tirsen* (tirren) adlanan boylarla qohumluğu, hətta eyniliyi haqqında bəlgələr verilir. Yunanlardan öncə pelaskların yaşadığı bölgələrdə türkcə *Selenqa, Tərtər* adlanan çaylar bəllidir. Adilə Ayda pelasq dilindəki *təpə* (tepae) sözünə dayanaraq onları türk sayır.[41] Yunanlıların etrusklara tirsen deməsi, Tirren dənizini *Tarkunia* adlandırması tarixi gerçəklikdir. Bu baxımdan, etruskların pelask boylarından olması fikiri yayğınlaşmışdır. Bu baxışı qüvvətləndirən faktlardan biri də Herodota görə həmin çağlarda pelasqlar yaşayan Lemnos adasında tapılan m.ö.VII-VI əsrlərə aid epitafiya yazısının etrusk dilinə və ya bu dilin bir dialektinə bənzəməsidir.[42]

Strabon yazır ki, Antiglidə görə Lemnos və İbros bölgələrinə ilk gəlib yerləşənlər pelasqlar idi, gerçəkdən də onların bir hissəsi sonra Atisin oğlu Tirrenin başçılığı ilə İtaliyaya

---

[40] *Odisseya*, IXI, 177; *İliada*, XVI, 223.
[41] *Ayda,* 1987, 19-21.
[42] Lemnos yazısından sonrakı bölmədə geniş danışacağıq.

keçmişdir. Sözünə davam edən yazar qeyd edir ki, pelasqlar Afinaya da gəlmişdi, burada attikalılar onlara "leylək" anlamında *pelarq* deyirdilər, çünki köçəri quş hara gəldi uçub qonduğu kimi bu köçəri boylar da eləcə yer dəyişirdi.[43]

Tarixçi-filosof Diogen Laertli məşhur yunan riyaziyatçısı Samoslu Pifaqoru "tirren" (pelasq) adlandırırdı. Virgili yazır ki, İtaliyanın ilk sakinləri pelasklar idi. Homerdən öncə yunan yazarlarının pelask əlifbasından istifadə etməsi, Avropaya yayılan çeşidli yazıların bu əlifbaya dayanması, İtaliyaya da əlifbanı pelask boyları tərəfindən gətirilməsi haqqında antik çağ yazarları məlumat verir. Quzey İtaliyada tapılan m.ö.V-II əsrlərə aid *ret* dilinin qısa yazıları ilə və bu dilə qohum sayılan *kamun* dili ilə, həmçinin Kiprdə tapılan yazıların dili ilə etrusk dili arasında əlaqə axtarılır. Lakin bu yolun elə bir perspektivi görünmür, çünki hələlik pelask dili kimi, ret, kamun və Kipr yazılarının dili tam aydınlaşmayıb və bu durumda bir bilinməzi başqa bir bilinməzlə izah etmək uğurlu sonuc verəcək sınaq deyil.



*Arnth · Sen Tin ate · kume (a)resa :*

Son vaxtlar pelask dilinə maraq alban yazarlarında artmışdır. O coğrafiyada tapılan qədim yazıların hamısını albanca oxumaq istəyi dəb halını alsa da, ortada uğur yoxdur.

Örnəyin, yas ovqatı əks olunmuş bu daşın üzərindəki yazını belə transkripsiya etmişlər: **ARNO SE N YI NA YE CUMA RESA.** Lakin yazıda aydın görünən hərflər və durğu işarəsi olan nöqtəyə

[43] *Strabon,* V. 2. 4.

görə, yazının transkripsiyası belə olmalıdır: **ARNTH· SEN TIN ATE · KUME (A)RESA :**

Başqa bir daş yazısını pelask-illiriya dilindən qalma mətn kimi təqdim edib onu albanca oxumaq isəmiş və buradan ipucu alıb etrusk dilinin də həmin qrupa daxil olduğunu söyləmişlər:

ЄΥ ΝΟΙΑ ΒЄΝЄ ΤΟΥ ΧΑΙΡЄ

| Pelasko-İllyrian | Albanian | English |
|---|---|---|
| ЄΥΝΟΙΑ = EYNOIA | E Yjnoia | Oh, deif her, |
| ΒЄΝЄ = BENE | bĕnĕ | make her |
| ΤΟΥ = TOY | tuajn | thine. |
| ΧΑΙΡЄ = HAIRE | Hajĕr | Be it for the Good! |

Çox aydın yazılışı olan bu mətni albanca oxuyub ona fantastik məna verməkdənsə, onu orta təhsilli bir türkə oxudub orada nə yazıldığını soruşsaydılar, təxminən buna yaxın belə bir cavab eşidəcəkdilər: "Yazıdan görünür ki, onun tapıldığı yerdə qoyun otaran bir türk dəliqanlısı evlənmək arzusunu, atasından umduğu istəyini daşa yazmışdır: *Ey nola, bene toy xaire* (qayıra)." Bu qiyabi sual-cavaba onu da əlavə edək ki, yazının tarixi də pelask çağından çox sonralara aid ola bilər, hun, avar, hətta peçeneq, kuman boylarının oralarda at oynatdığı çağlarda yazlması gerçək duruma daha yaxındır.

**2. Etruskların sami xalqlarından sayılması.**

Hələ 1498-də monax Annio da Biterbo yazırdı ki, guya etrusklar aramey dilində danışan Nuhun nəslindəndir. XIX əsrdə etrusk dilini sami dilinə bağlayan Yohann Gustav Stickelin tədqiqat üsulu haqlı olaraq tənqid olunsa da, onun irəli sürdüyi fikri davam etdirən alman dilçisi İ. Şrekel İtaliyada *Arno* çayadını Bibliyada adı keçən *Arnon* çayı ilə bağlamaq istəmişdir. Etruskların samilərlə qohumluğunu savunanlar

indi də vardır. Belə ki, Gari L. Alont bir neçə etrusk yazısının oxunuşuna aid kitabında Pirgi və Lemnos yazılarını ivrit dilinə söykənərək tərcümə etməyə çalışır.[44]

Etrusk dilində bir neçə sami sözünün olması, sami əlifba sisteminə yaxınlıq göstərir ki, etrusklar hələ İtaliyaya gələnə qədər sami kökənli boylarla təmasda olmuşlar. Bu əlaqələr hələ Anadoluda ikən arameylərlə qonşuluq və ya ticarət nəticəsində baş vermişdir. Lakin söz alış-verişi qohumluq kimi yozula bilməz.

### 3. Etruskların hindavropa xalqlarından sayılması.

Etrusk dilinin hindavropa mənşəli sayılması elmi ədəbiyyatda geniş yayılmışdır. Bu yöndə aparılan araşdırmalar XIX əsrin ortalarından sonra xeyli çoxalmış, hindavropa dillərinin ayrı-ayrı qolu ilə etrusk dilinin uğursuz müqayisələri aparılmışdır. İki tomluq "Etruria celtica" adlı əsərini 1842-də nəşr etdirən irlandiyalı yazar V. Betham bir sıra etrusk sözünü kelt dililə açmağa cəht etsə də, bir nəticə əldə etməmişdir. Həmin çağlarda etrusk dili açarını german dillərində axtaranların da sayı artmaqda idi.

Çağdaş diçilik elminin əsasını qoyanlardan biri Ferdinand de Sössür yazır ki, etrusk dilində danışan xalqın latınlardan köklü şəkildə fərqləndiyini görmək üçün dördcə sətir etrusk yazısına baxmaq kifayətdir.[45] V. Korssen isə etrusk dilini latın, yunan, osk və umbr dillərilə müqayisə edib onları qohum dillər kimi dəyərləndirmiş, lakin bu yolda başarısız olmuş, çap edilən kitabı isə V. Deeke tərəfindən kəskin tənqid edilmişdir.[46] Sonralar həmin yazarın özü də tənqid etdiyi bu yanlış yola düşmüşdür. A. Barromei də yazdığı "Etrusk qrameri" (1877) kitabında yunan-latın və sanskrit dillərinin kö-

---

[44] *Alont,* 2003.
[45] *Соссюр,* 1977, 260.
[46] *Deecke,* 1875.

məyi ilə etrusk dilinin şifrəsini çözməyə çalışmışdır. Həmin çağda R. Ellis də etrusk dilini hay (erməni) dili ilə müqayisə etmək istəmiş, lakin sonra bunun bir nəticə verməyəcəyini görüb fikrindən daşınmışdır.[47]

Etrusklarla pelaskların dil qohumluğu üzərində dayanan Y. Tomopulos isə hindavropa kökənli albanları pelaskların törəməsi kimi vermiş və dolayısı ilə etrusk-alban müqayisəsini mümkün saymışdır.[48] Son çağlarda isə Lemnos yazısını albanca oxumaq istəyən N. Vlora Falaschi bu yöndə tədqiqat aparır. Lakin onun verdiyi yazıların transkripsiyası gerçək durumu əks etditmir.

Etrusk dililə slav dilləri arasındakı əlaqə daha çox rus dili üzrə aparılmışdır. Bu əlaqədən bir neçə örnək verən slavist Faddey Volanskinin yanlış örnəkləri üzərində yanlış yozumlar yapan Yeqor Klassenin (1854) yazılarında və Aleksandr Çertkovun hələ 1853-də Moskvada nəşr olunan iki kitabında bəhs edilir.[49] Tarixçı-slavist kimi tanınan A. Çertkov hərbi karyerasını bitirib təqaüdə çıxandan sonra slav tarixilə məşğul idi. Onun pelaskları slavların soy babaları kimi təqdim etməsi ciddi qarşılanmadı, yazdığı kitablar da tezliklə unuduldu. Lakin son vaxtlar Rusiyada yenidən etrusk tarixinə maraq xeyli artmış, etruskların dilinə aid bilgəsəl kitablarla yanaşı, elmdən çox uzaq Q. S. Qrineviç, V. A. Çudinov kimi yazarların əsərləri nəşr edilir ki, onların üzərində dayanmağa dəyməz, bir rus alimi onları "slavşünaslıq elminin üzqarası" adlandırmaqdan çəkinməmişdir.

Etrusk dili açarının hindavropa dillərində axtarılmasına yönəlik çalışmalar hələ də davam edir."Etrusklar danışmağa

---

[47] Londonda basılan "*The Armenian origin of the Etruscans*" (1861) adlı əsərində Robert Ellis ektuskların erməni (hay) mənşəli olduğunu irəli sürsə də, bu fikir elmi dairələrdə qəbul olunmamışdır.

[48] *Thomopulos,* 1912.

[49] *Чертков,* 1853; 1853 a.

başladı" adlı əsərin yazarı Sarbon universitetinin professoru Zakari Mayaninin etrusk dilinin açılması üçün alban dilinin önəmini şişirdən üç kitabı 1970-lərdə basılmışdır. Uzmanlar isə bu kitabları diletant qələminin məhsulu adlandırmışlar.

Bolqar dilçisi B.İ. Georgiyev etrusk dilini lidiyalıların dili kimi təqdim etməyə çalışmış, lakin bunun uğurlu nəticəsi olmamışdır. Doğrudur, hindavropa mənşəli xalqlarla əhatə olunan etruskların dilində hindavropa dillərinə aid elementlərin olması doğaldır, son nəticədə etrusk dili elə latın dilinin içində əriyib yox olmuşdur. Lakin bir gerçəkliyi unutmaq olmaz ki, etrusk dilinin morfonologiyası və morfologiyası hindavropa dillərindən tipoloji, həm də genetik baxımdan kəskin fərqlənir, onlar mənşəcə başqa-başqa dil ailələrinə mənsubdurlar.

Bəzi çağdaş araşdırıcılar tirsen dilini hindavropa dil ailəsi ilə birbaşa deyil, dolayı (distant) bağlarla əlaqəsini irəli sürür. Distant əlaqə mümkündür və etrusk dilində hindavropa sözlərinin olması da doğaldır. Lakin bu baxış etriskların kimliyini deyil, etruskların kimlərlə kontaktı olmasını müəyənləşdirmə baxımından bəlgələr verə bilər.

**4. Etruskların qafqazdilli xalqlardan sayılması.**

Etrusk dilini Quzey Qafqaz dillərilə geniş müqayisə edən V.Tomsen ilk dəfə leksik qatda deyil, qramer qatında eynilik axtarılmasının elmi yararını göstərmişdir. Onun yorumuna görə, bu dillərin yiyəlik (-l), lokativ (-ti) hal və cəmlik bildirən (-r) şəkilçiləri arasında oxşarlıq vardır.[50] Vaxtilə N. Marr Etrusk-Qafqaz bağından danışmış, sonra etrusk dilinə Yafəs nəzəriyəsilə şərh vermişdir. S. Ferri də etruskların Dağıstan xalqları ilə qohumluğu üzərində axtarış aparmışdır.

---

[50] *Tomsen,* 1899.

Son illərdə etrusk dilinin qafqaz dillərilə əlaqəsi haqqında yazan alimlərlə yanaşı çoxlu həvəskar da meydana çıxıb. Bu yöndə aparılan araşdırmalar nax-dağıstan dillərindən sayılan hurri və urartu dillərilə etrusk dilinin qohumluğuna aid İ. M. Dyakonovun irəli sürdüyü fərziyə ilə təpərini artırmış, tərəfdarların sayını çöxaltmışdır. Əvvəlki yazılarında etrusk dili ilə hat və Quzey-Qafqaz dilləri arasında qohumluq axtaran V. V. İvanov son yazılarında bundan vaz keçib yalnız hurrri və etrusk bağından danışır.

**5. Etruskların türk sayılması.**

Bir neçə il öncə etrusk problemilə bağlı Belarusiyada keçirilən elmi konfransda Toskan universitetinin genetika uzmanı professor Paolo Altsetta məruzəsində etruskların DNA göstəricisinin daha çöx xazərlərin DNA-sına uyğun gəldiyini söyləmişdi. DNA uzmanının bu bəyanatı orada sensasiya kimi qarşılandı, çünki bu son elmi bəlgə etruskların Volqa və ya Xəzər yaxalarından İtaliyaya getməsi fikrini, həm də etrusk-türk əlaqəsini gündəmə gətirirdi. Lakin etruskların türk sayılması fikri yeni olmayıb əvvəllər də söylənmişdir. V. Brandenşteyn hələ 1937-də etrusk dilində türk sözlərindən bəhs etmişdir.[51] Doğrudur, on il sonra o, "Tyrrhener" başlıqlı yazısında etruskları türklərə deyil, protohatlara bağlayır, lakin hat dilinin özündə də türkizmlər vardır. Vaxtilə fransız orientalist Vaux de Carra (1911) etrusk dili ilə Altay dilləri arasında əlaqə olmasını qeyd edirdi.

Uzun illər etrusk yazılarını türkcə oxuyan qocaman yazar Kazım Mirşan xoca və onun davamçıları bu sahədə gərəkli bəlgələr toplamışlar, lakin onların dilcilikdə qəbul olunmuş metodlarla deyil, xocanın özəl metodu ilə apardıqları araşdırmalar hələlik uğur gətirməmişdir.

---

[51] *Brandenstein,* 1937.

İtaliyada diplomatik vəzifədə çalışdığı illərdə etruskların tarixilə yaxından taniş olmaq imkanı əldə edən Adilə Ayda italyan, fransz dillərini yaxşı bildiyi üçün gərəkli ədəbiyatla və etrusk kulturundan qalan mirasla tanış ola bilmişdir. Bu kübar xanım məşhur siyasi xadim və türkçü alim Sadri Maqsudi Arsalın qızı idi. Adilə xanım vaxtilə atasının başladığı türk-etrusk ilişkilərinə aid araşdırmanı davam etdirdi və bu mövzu üzərində ömrünün sonunacan çalışdı və etruskların türk olmasına dair fransız və türk dillərində 5 kitab yazdı.[52]

Etrusk yazılarını türkcə oxumağa çalışan Polat Kaya da bu yöndə bir neçə məqalə yazmışdır. Etrusk zəri üzərində say bidirən sözlərin oxunuşu ilə bağlı Polat Kaya ilə yanaşı Selahi Diker və Haluk Berkmen fərqli yozumlar versələr də, onların məqalələrində diqqəti çəkən baxışlar vardır.

Etrusk-türk dil əlaqələrinə aid tatar yazarı F. P. Latıpovun da tədqiqatları vardır. Onun müəyən etdiyi etrusk-tatar paralellərinə aid sözlər mətn daxilində verilmədiyi üçün onları yoxlamaq imkanı olmadı. Lakin belə türkizmlərin əhəmiyətini nəzərə alıb həmin sözləri burada verməyi məqsədəuyğun saydıq:

ak (*ağ*), epteshio (*iptəş*), tamasa (*tamaşa*), zer (*cir~yer*), tamax (*damağ*), kus (*quş*), ful (*yul*), han (*qan*), set (*süd*), ina (inə~*iynə*), zukis (*çukeç~çəkiç*). [53]

Etrusk probleminə tatar türkoloqlarından prof. Mirfatıx Zəkiyevin yanaşması gerçək elmi əsası olan daha rasional baxışdır. M. Zəkiyevə görə hindavropa dillərinin daha güclü təsiri altına düşən etrusk dili yakut (saxa) və çuvaş dillərinə nisbətən ilkin türk dil quruluşundan daha çox uzaqlaşmış, ancaq bəzi ilkin türk elementlərini saxlaya bilmişdir.[54]

---

[52] *Ayda,* 1985; 1987; 1992.

[53] Bunlardan *tamaşa* və *süd* sözlərinin yazılış variantı yanlış verilmişdir.

[54] *Zəkiyev,* 1998.

Etrusk-türk əlaqələrindən bəhs edənlərin sırasında azərbaycanlı tədqiqatçı Cingiz Qaraşarlı dilçi olduğundan təhlil etdiyi misallara daha profesional yorum verə bilmiş, Troya, Trakiya, Yunan və İtaliya onomastikasında substrat sözlər içində bəzi türkizmlərdən bəhs etmiş, etrusk dilində *papak* (bəbək), *flerth* (belirt), *puya* (bayan, bəyim), *thur* (törəmə), *dili* (dəli) kimi sözlərin anlamını doğru tapmışdır. Bəzi sözlərə, deyimlərə yanlış yorum versə də, *hermial kapzına salman* (Herminin qapısına saldırma), *sukik fir* (sücuq ver) kimi deyimləri düzgün izah etmişdir. C. Qaraşarlı etrusk-türk əlaqəsində haqlı olaraq çuvaş dilini önə çəkir: "Çuvaş dilinin etrusk və pelask dillərilə fonetik və morfoloji yaxınlıqları bu dilin, ümumiyətlə bulqar qrupu türk dillərinin mənşəyi məsələsinə yenidən baxmağı tələb edir".[55]

Təssüflə qeyd olunmalıdır ki, etrusk-türk bağından bəhs edən yazarların əksəri özündən başqa bu qonuda araşdırma aparan kimsənin adını çəkmir, yalnız bir-iki yerdə A. Ayda və K. Mirşanın sadəcə adının xatırlanması istisna olmaqla bu mövzuda yazılmış əsərləri "görməzdən" gəlirlər. Sanki bu metodla özlərini təsdiq etmək istəyirlər.[56] Belə durumun səbəblərindən biri də türk yazarlarının bir-birinin tədqiqatından xəbərsiz olması, bir-birinin kitabını oxumamasıdır. Bu yöndə koordinasiya mərkəzinin olmaması da özünü göstərir.

**6. Etruskların macar (hunqar) sayılması.**

Etrusk dilinin finuqor, özəlliklə macar (hunqar) dililə qohumluğu haqqında xeyli yazılar var. Hələ 1874-də araşdırıcıların diqqətini bu mövzuya cəlb edən Britaniya din xadimi

---

[55] *Qaraşarlı,* 2005, 20-21.

[56] Sıralarında tanınmış genetik prof. Ahmet Arslan, ömrünün 70 ilini bu sahəyə həsr etmiş Kazım Mirşan xoca da olmaqla bir qrup alimin (T. Parlak, T. Tüfekçioğlu, R. Jdanov, Y. Gibadulin) birgə yazdığı araşdırmada bizim fikirlər, xəritə və sxemlər verilib qaynaq göstərilmişdir (*Etrüskler*. Türk Tarih Kurumu. 2008).

İsaak Teylor olmuşdur. Fransız şərqşünas Baron Carra de Vauks (1911) etrusk dilini Altay dil ailəsilə müqayisə etmiş, Jüle Marta isə etrusk-macar dil əlaqəsinin tədqiqinə təkan verən "La langue étrusque" (1913) adlı əsər yazmışdır. Bu yöndə araşdırmaların sayı sonralar daha da artmışdır. Alman dilçi Georq Zigvard (1917), Feliks von Pograni-Nagi (1938), tarixçi Viktor Padani (1964) kimi bəzi yazarlar etrusk-macar müqayisısinə sumer dilini də cəlb etmişlər. Son vaxtlar isə matematik professor Alfred Toth (2007) bu sıraya hunları əlavə etmişdir. Lakin bütün bu araşdırmalar tarixi-müqayisəli metoda dayanmadığı üçün elmi dairələrdə ciddi qəbul edilmir. Ancaq İtaliyanın tanınmış qocaman dilçi alimı professor Mario Alinei 2003-də nəşr etdirdiyi "*Etrusk dili hunqarcanın qədim formasıdır*" adlı kitabı ilə Avropa alimlərini əməlli-başlı silkələdi, çünki iki il sonra macar dilində də çap olunan bu kitabın müəllifi sıradan biri deyildir.[57]

İtaliyaya Karpatlardan keçıb gələn və daha öncə türk dilinin güclü təsirinə uğradığı aydın görünən etruskarın protomacar (protohunqar) boylarından olduğunu söyləyən M. Alinei etrusk dilində vəzifə bildirən bəzi sözləri, titulları türkizmlər sayır. Yazar macar-etrusk qohumluğunu hər ikisinin tipoloji baxımdan birləşik dil olması, bəzi qramer oxşarlıqları ilə və fonetik baxımdan bu dillərin səsuyumu (harmonia) qanunu ilə əsaslandırmaq istəmişdir. Hələlik onun irəli sürdüyü konsepsiya akademik dairələrdə sükutla qarşılanır, ilk etirazlarsa etruskoloqlardan deyil, uralşünaslardan gəlmişdir.

---

[57] YUNESKO-da "Atlas Linquarum Europae" qurumunun prezidenti olan professor Mario Alinei daha çox dialektoloq kimi tanınır. Avropa dilçilik elmində kompüterdən istifadə texnologiyasının pioneri sayılan M. Alineyi həm də Avropanın paleolit çağı dil durumuna aid "Continuiti teoriyası"nın müəllifi və elmi sambalı ilə seçilən "Quaderni di semantica" jurnalının yaradıcısı, həm də baş redaktorudur.

Bizcə, M. Alineinin irəli sürdüyü yeni konsepsiya Altay teorisinə deyil, Urmu teorisinə uyğun, yəni Troya çağında Anadoluda türk varlığı üzərində qurulsaydı, ona irad tutanların arqumentləri azalardı. Çünki əsas iradlar etruskların quzeydən gəlmə fikrinə qarşıdır. Etruskların Kiçik Asiya ilə bağlılığı az da olsa, hat dili ilə olan bəzi leksik paralellərdə də görünür.

***

Göründüyü kimi, etruskları bir çox xalqlarla bağlamışlar, bu sıraya etrusklarla sumer və dravid dilləri arasında əlaqə arayan bəzi yazarların fikrini də əlavə etsək, etruskologiya elminin çətin sınaqlardan keçdiyini söyləmək olar. XIX əsrin sonlarında yazdığı əsərində D. Brinton etruskların hətta Afrika mənşəli bərbər, kabil, tuareq xalqları ilə qohumluğu fikrini irəli sürmüşdür. Etruskları dravid xalqlarından sayıb tamil boyları ilə bağlamaq ustəyənlər də olmuşdur. Əlbəttə, belə yanlış yozumlar həm də etruskologiya elminin inkişafını ləngitmişdir.

Son vaxtlar etruskların soykökü probleminin çözüm yollarının çıxmaza girdiyini bilənlər o dalandam çıxma yolunu bəlli dil ailələrindən kənarda qalan “izolyat dil” yozumunda görürlər. Bunun üçün etrusk, lemni, reti dillərini əhatə edən qurama “Tirren dil qrupu” deyə yeni baxış formalaşdırmaq istəyirlər. Lakin bunun bir nəticə verməyəcəyi bu başdan bəllidir, çünki qrameri bəlli olmayan dillərin üzərində qurulan bir dil qrupunun elmi yaşamı sabun köpüyü ömrü qədərdir. Etrusk dilinə olan maraq bir çox fantastik fikirlərin söylənməsinə nədən olsa da, etruskologiyanın elmi axara düşməsində də A. Y. Pfiffiq, H. Riks, M. Pallottino, A. Trombetti, A. İ. Xarsekin, L. Bonfante və başqa etruskologların apardığı araşdırmaların böyük qatqısı olmuşdur. Etrusk dilinin bağlı qapısını açmaq üçün yola çıxan araşdırmaçı əlində bir-iki dilin açarını tutmalıdır. Bu açar dillərdən biri türk dilidir.

# QAFQAZ (AZƏRBAYCAN) - TROYA - ETRURIYA BAĞI

Herodot İtaliyaya etrusk (*tirsen*) boylarının Lidiyadan köçdüyünü yazır. Belə bir köçün daha əvvəllər Troyadan olması haqqında da bilgi vardır. Olsun ki, Anadolunun batı bölgələri sayılan Troya və Lidiyadan olan köçlərdə bir neçə yaxın qonşu və qohum boylar iştirak etmişlər. Bunlar eyni və ya fərqli dildə danışan boylar ola bilərdi, ancaq bunların içində türklərin olması və onların da Anadolunun batı bölgələrinə doğudan, Anadolunun doğusundan və Qafqazın güneyindən gəlməsi quşqu doğurmur.

S. Ferri etruskların Qafqazla bağlı olmasını Etruriyanın onomastikası ilə yorumlamışdır. Yazar Etruriyada mövcud olmuş rutul, kaska etnonimlərinin və Aqill, Sovan toponomlərinin qaynağını Qafqaz xalqlarından *rutul, aqul, svan, kaska* boyları ilə bağlayır.[58] Əslində, qədim kaskaylar (*qaşqay boyları*) Qafqazda deyil, hatların quzey-doğu qonşusu kimi m.ö. II minilin başlarından Anadolunun orta bölgəsilə Qaradəniz arasında yaşayan türk boyları idi.[59]

Qafqaz-Etrusk paralelləri sırasında daha çox etnotoponim diqqəti çəkir, çünki boyadı ilə yaranmış toponimlər adını daşıdığı boyun həmin yerdə yaşadığını göstərən tarixi tutalqa sayılır. Bu baxımdan, Qafqazda olan boyadları İtaliyada da görürüksə, bunların içində *alban, araz, ermen, qamər, kaspi, qapan, qaradon, ərsaq, subar* kimi türk etnonimləri və *aqul, udi, çeçen, silv, rutul* kimi qafqazdilli boyadlar da varsa, deməli, miqrasiyada türk və qafqazdilli boylar iştirak etmişlər.

Əgər Qafqaz-İtaliya paralelləri kimi görünən *silv-silviya* (soyadı), *rutul-rutul* etnonimlərini, *Çeçen-Çeçina, Udi-Udin* etnotoponimlərini, *Aqul-Aqill* toponimlərini qafqazdilli say-

---

[58] *Ferri,* 1964, 497-498.

[59] Qədim kaskay (qaşqay) boyu haqqında geniş bilgi üçün bax: *Ağasıoğlu,* 2005.

saq, aşağıdakı qarşılaşdırmada türkcə olan örnəklərdən yalnız *Tarqu* şəhərinin Dağıstanda, *Tiberda* çayının Karaçay elində (Tatarstanda *Timer* çayı var) olduğunu nəzərə alsaq, yerdə qalan adların Azərbaycanda, Xəzərdən Doğu Anadoluyacan uzanan bölgələrdə olduğunu görərik:

| QAFQAZ-AZƏRBAYCAN | İTALİYA |
|---|---|
| **Alban** (yeradı, boyadı) | **Alban** (yeradı, boyadı) |
| **Albana** (çayadı) | **Albina** (çayadı) |
| **Arpa** (toponim) | **Arpi** (toponim) |
| **Araz** (çayadı, teonim) | **Arezzo** (etnotoponim) |
| **Aras-pican** (etnotoponim) | **Aras-ena** (etnotoponim) |
| **Arsaq** (etnotoponim) | **Artsak-ena** (Sardinyada yeradı) |
| **Ermen** (etnotoponim) | **Arimin** (toponim) |
| **Çiloy** (ada) | **Cilo** (ada) |
| **Tiber** (çayadı) | **Tibr** (çayadı) |
| **Kamər** (yeradı, boyadı) | **Kameriya** (şəhər) |
| **Kapan** (etnotoponim) | **Kapen** (şəhər) |
| **Karadon-lu** (etnotoponim) | **Kortona** (şəhər) |
| **Kaspi** (etnotoponim) | **Kasperia** (şəhər) |
| **Kür** (çayadı) | **Kuri** (şəhər) |
| **Ordu-bad** (yeradı) | **Orte** (şəhər) |
| **Subar** (etnotoponim) | **Sibaris** (şəhər) |
| **Tarqu** (etnotoponim) | **Tarquini** (şəhər) |

Göründüyü kimi, həm Qafqaz (Azərbaycan), həm də İtaliyada eyni etnotoponimlər vardır və bunların kökündə araz, subar, alban, arsaq, ermən, kamər, kapan, kaspi kimi türk boyadları durur. Yuxarıda bugünkü durumla bağlı qafqazdilli kimi verilən Udi, Çeçen etnotoponimlərin və rutul etnoniminin o dönəmlərdə qafqazdilli söz olduğunu sübut edəcək

əlavə bəlgələr yoxdur, əksinə, Udi və Çeçen adları daha çox doğu türk ellərində işlək adlardır. Eneyin də rutul boyları ilə savaşda öldüyünü yazan Appian rutulları *tirren* boylarından biri kimi verir (Ῥουτούλων τῶν Τυρρηνῶν). Bəzi antik çağ yazarlarına görə isə, İtaliya əhalisi içində ən çox etrusklarla barışda olub dostluq edənlər *sibar* boyları idi.[60]

Etruskların, daha doğrusu, protoetruskların Azərbaycandan Anadolunun batı bölgələrinə, oradan da İtaliyaya köçməsini təsbit etmək üçün öncə köç olayının tarixini və həmin köçün hansı adı daşıyan boylara aid olmasını ortaya çıxarmaq gərəkir. Etruriyaya miqrasiyanın Troyadan və Lidiyadan müxtəlif tarixdə olması Qafqaz-Troya və Qafqaz-Lidiya yolunu keçən köçlərin də fərqli tarixlərə aid olmasını ortaya çıxarır. Belə ki, Troya savaşından öncə baş vermiş Qafqaz-Troya köçünün tarixi m.ö. XIII əsrdən əvvəlki çağlara aiddirsə, Qafqazdan Lidiyaya köçün tarixi də m.ö.VIII əsrdən əvvələ aiddir.

Strabon qeyd edir ki, yunanlarla savaşdan öncə 9 sancağa bölünən Troya Priamın vaxtında vahid ölkə kimi idarə olunurdu.[61] Savaşdan sonra burada Eneyə qoşulub İtaliyaya üz tutan köçmənlərin içində türklərin də ola biləcəyini göstərən bəlgə əsasən onomastik sozlərdir. Belə ki, burada türk izini əks etdirən İdı və Qarqar dağları (oronimləri), Tarna bölgəsi vardı, türk ellərində yayğın olan Dardan, Eney, Priam (*Pirim, Piryam*), Askaniy (*Azkan*), Paris (*Barıs*), Alber (*Alpər*), Prok (*Pörük*) və Amuliy (*Amulca*) kimi şəxsadları (antroponim) işlənirdi. Etruskların *Turan* dediyi Afroditanın Troyada epiteti *Bayana* idi.

Azərbaycanla Troya və Etruriya arasındakı əsas bağ isə ***as*** boyu, ***Asar*** (Azər) teonimidir. Etruskologiyada yayğın fikirlərdən biri də budur ki, etrusk yazılarında işlənən *eis//ais*

---

[60] *Немировский*, 1983, 57.
[61] *Strabon*, XIII. I. 7.

sözü "tanrı"anlamındadır və *aiser* (tanrılar), *aislu* (tanrısal) sözlərinin kökündə də həmin ***ais*** sözü durur. Bəzi skandinav xalqlarında da eyni durumla qarşılaşırıq. Yuxarıda islandca tanrı anlamında ***æs*** [au:s] sözünün, cəmdə isə ***æsir*** sözünün işlənməsindən danışmışdıq. İndisə bu sözün Skandinaviyaya haradan aparılmasını göstərən qaynağa baxaq.

Snorri Sturluson 1225-də bitirdiyi "Kiçik Edda" əsərini Skandinav saqaları əsasında yazmış, Avropanın quzeyinə ***as*** boyunun Troyadan gəlməsini özəllikə vurğulamışdır. Yazar əsərində Troya ilə bağlı bu deyimləri işlədir: [62]

> Troya ***türk*** ölkəsidir (səh.10). Türklərin olkəsini tərk edib (səh.11), Avropaya gələn ***aslar*** buraya *türk gələnəkləri* gətirdi və burada *türk törələri* tətbiq olundu (səh.12).

Göründüyü kimi, həm etrusk, həm də island dilində olan ais//as teonimi Troyadan aparılmış *as* boyadı ilə bağlıdır. Bu boy isə *azər* etnoniminin və *Azər* teoniminin kökündə duran qədim *aslardır* ki, bunlar da Göytürk yazılarında adı keçən türk boyudur. Dolayısı ilə, Azərbaycandan Troyaya, oradan da İtaliya və Avropanın quzeyinə *as, aser* sözlərini aparan türklərdir.[63]

Troya və Lidiyadan İtaliyaya köçən türk boyunun və ya boylarının adını öyrənmək üçün önçə etruskların öz adına və onlara kənardan verilən adlara baxmaq lazımdır. Hələ antik çağ yazarlarından Halikarnaslı Dionisi etruskların özlərinə *rasena* (ρασεννα) dediklərini qeyd etsə də, adın yorumunu, sözün anlamını verməmişdir.

---

[62] *Младшая Эдда,* 1970; Geniş məlumat üçün bax: *Azər xalqı,* 2000.

[63] Asiya qitəsi adının mənşəyini izah edən Heredot bu adın Prometeyin arvadı Asi-yanın adından yarandığını qeyd edir və bir Lidiya rəvayətinə görə də Asiya adının Kotinin oğlu, Manesin torunu Asienin adından törədiyini və başkənd Sardın bir məhəlləsinin də *Asiad* adlandığını yazır (*Herodot,* IV. 45).

Dionisinin İki minil öncə verdiyi həmin məlumata müxtəlif yorumlar yazılmış, lakin rasena adının gerçək açımı hələ bulunmamışdır. A. Trombetti bu adın *rasena* deyil, *arsena* olacağını yazmışdır.[64] Yazar gerçək duruma doğru bir addım atsa da, ikinci addımı atmayıb yarıyolda qalmışdır. Belə ki, *arsena* sözü, daha doğrusu, *arasena* etruskların boyadını yox, yurdlarının adını bildirən ***Arasena*** toponimidir, boyadlarısa ***aras*** etnonimidir. Deməli, etrusk yazılarında *Raśna* sözünü "aras eli" anlamında Arasna (Arasena) şəklində oxumaq lazımdır. Azərbaycanda isə araz//aras boyadı bir sıra toponimin kökündə durur, hətta qədim çağlarda boyadları bildirən azər-bi, tras-pi, kas-pi etnonimləri kimi aras-pi boyadı ilə də düzələn *Arospican* (aras-pi-can) toponimi vardı və bu bölgə Aras çayının orta axarı yaxalarına yaxın idi. Buradakı Arazboyu bölgələrdə *Arazdəyən* toponimi, musiqi adı *arazbarı* deyimi olduğu kimi, Urartu çağında da *Araz-aşqu* (Arzaşku) toponimi və *Aras* teonimi ($^{d}$a-ra-za) vardı. Göründüyü kimi, Azərbaycanda qədim çağlardan araz sözü teonim, etnonim, və etnotoponim kimi işlənmişdir.

Deməli, etruskların özadı olan *aras* etnonimi protoazərlər içində *aras* (araz) boyadı kimi işlənirmiş. Türkdilli aras boyunun dili və əlifbası kimi, adı da müxtəlifdilli protoetrusk boylarının qovuşmasından yaranan etrusk toplumunun ortaq özəlliyi kimi dəyər qazanmışdır. Ancaq etruskların öz içində baş verən bu sosial olayla yanaşı, bir də etrusklara dışarıdan verilən ***etrusk*** adı və o adla tanınması durumu vardı.

Bəzi uzmanlar *etrusk* adının *turski* etnonimindən önqoşma (*e*- prefiksi) ilə yarandığını söyləyirlər, lakin sami dillərində *etrak* (türk), *ekrad* (kürd) deyimi *turusk* > *etrusk* dəyişməsi-

---

[64] *Trombetti*, 1934, 46: Bizanslı Stefan araz boyunun Pont yaxasında da bir ΄Αραζος (Arazos) adlı şəhərindən bəhs etmişdir (*Гиндин-Цымбурский*, 1987, 29). Görünür, araz//aras adlı boyların batıya miqrasiyası müxtəlif zamanlarda ayrı-ayrı dalğalarla baş vermişdir. Onların adına sonrakı bölmədə Lemni yazısında da rast gəlmək olur.

ni mümkün edir, yəni *etrusk* deyimi aramey və ya başqa bir sami boyunun dilində *turusk boyadının cəmlik forması kimi ortaya çıxa bilərdi. Bu baxımdan, öz içindən deyil, dışarıdan verilmə *etrusk* adının etimologiyası üçün qədim qaynaqlarda keçən *tirsen, tiras, turis*, *turşa* boyadlarına baxmaq gərəkir.

"Dəniz xalqları" adı ilə anılan boylar iki dəfə, biri Firon Merneptax (1225), digəri III Ramses (1192) çağında Misirə yürüş etmişlər. Troya bu son yürüş dönəminə yaxın çağda yunanlılar tərəfindən dağıdılmışdı. Misir yürüşünə qatılmış *turuş* boyunu etrusklar olduğunu güman edən alimlər vardır. Vaxtilə biz də *turşa//turuş* etonimilə *turk//turuk* paralelliyini vurğulayaraq bu boylardan bir qisminin *tirsen//etrusk* adı ilə İtaliyaya köçdüyünü yazmışdıq.[65] Bu, Herodotun verdiyi bilgiyə də uyğun gəlir. Köç səbəbinin Kiçik Asiyada başlanan aclıqla bağlı olması həm də Merneptaxa aid bu yazıda əksini tapmışdır: "*Onlar Misirə aclıq üzündən gəlmişdi*".[66]

Herodot *tirsen* (etrusk) boyadını Lidiya elbəyi Atisin oğlu *Tirsenin* adı ilə bağlı yarandığını və tirsenlərin İtaliyaya köç nədənini quraqlığın gətirdiyi aclıq fəlakəti ilə bağlayır.[67] Etruskların öncə Sardiniya adasına, sonralarsa oradan İtaliyaya köçməsini əsaslandırmaq istəyənlər Sardiniyada olan *Tirsus* çayadına dayanırlar. Lidiyada da Sard şəhəri vardı. Antik çağ yazarları buradakı tirren boylarının *tirsis* (tyrsis) adını "qala", *tirsen* boyadını da "qalalı" anlamında yozmuşlar.[68]

Herodotun saqa boyu kimi verdiyi *traspi* (*tiras-pi), *Tiras* çayının adı, X əsrdə Xəzər xaqanının məktubunda türk boyu kimi adı çəkilən *tirs* (turis) boyu haqqında Skandinav tarixi

---

[65] *Azər xalqı*, 2000, 47 (59); 2005, 55-56.

[66] *Римшнейдер*, 1977, 17.

[67] *Herodot*, I. 94.

[68] *Немировский*, 1983, 58.

bəlgələrində "Türklər Nuhun torunu *Tiras* soyundan törəmişlər" deyimi keçir.[69]

Etrusk yazılarında (Kortona yazısı) keçən *tarsminaśś* və *tersna* sözlərini İtaliyadakı *Trasimeno* gölünün adı ilə bağlayanlar var. Trakiyada bir boy başçısının adında gördüyümüz *Teres* sözünə Dədə Qorqud kitabnda *Dirsəxan, Tərsuzamış* adlarında, Anadolunun Kilikiya, Mersin, Dersim bölgələrində *Tars*(*us*) adına rast gəlirik. Bir Asur qaynağında və Bibliyada keçən *Tarsis, Tarşiş* yeradının Lidiya və Troyaya yaxın olan Lesbos, Lemnos adalarında yaşamış *tirsen* (tirren) boylarının adı ilə bağlı olması da elmi ədəbiyatda qeyd olunur.[70] Beləliklə, Lidiya bölgəsindən İtaliyaya köçən tirsen (tirren) boyunun adındakı ***tirs*** (tirs-en) sözü ters//turs fonetik variantları ilə qarşımıza çıxır.

Latınların çətin tələffüz edilən *tursk* adını *tusk* şəklinə salıb etruskların bölgəsini *Toskana* adlandırması vaxtilə Dağıstanda olan *tusk* boyunu yada salır. Klavdiy Ptolemey Qafqaz və Kerav dağları arasında Xəzər dənizinə çatmamış *tusk, didur* boylarının yaşadığını yazır. Bəzi uzmanlar bu tusk boyunun Pomponiy Melanın adını çəkdiyi *turk* boyu olacağını qeyd edirlər.[71]

Beləliklə, etruskların özadı ***aras*** və onlara dışarıdan verilən *tirs-en//turs-k* adının ***etrusk*** variantı ilə etrusk yazılarında *raśna,* latınca *etrusci*, italyanca *etruschi*, *tusci*, yunanca *τυρσηνοί, τυρρηνοί* şəklində ortaya çıxması normal haldır. Hər iki etnonimin (aras, tirs) türklərlə bağlı olması da tarixi qaynaqlarda qeyd olunmuşdur. Lakin protoetruskların ümumi adına çevrilən bu iç-dış (aras, etrusk) boyadlarından başqa etruskların içində *qayı, urum, qamər* kimi başqa türk soy və boyların olması da istisna deyil.

---

[69] *Мельникова,* 1986, 65.
[70] *Немировский*, 1983, 34.
[71] *AİOSK*, 1990, 150.

Latın çağında Romulus adlanan, italyanların *Romolo* dediyi adın *Urumulu* (Urmulu) şəklində bərpası mümkündür. Anadoludan gələn etruskların içində asur-urartu qaynaqlarından bəlli olan *urumu* (*urme*) boyu Van gölünün quzeybatısında yaşayan boylardan idi. İndiki Muş ovalığında olan Urman kəndinin adını Subar bəyliyi çağından qaldığını vurğulayan N. V. Arutyunyan yazır: "Düşünmək olar ki, Urartu qaynaqlarında Urme, Asur qaynaqlarında isə İç Urumu kimi verilən ölkə (bölgə) *urum* boyunun adından yaranmışdır".[72]

Azərbaycan-Etruriya və türk-etrusk əlaqələri təkcə dil və onomastika ilə deyil, paralel mifoloji motivlərdə, etnoqrafik bəlgələrdə də görünür. Örnəyin, başqa xalqların inancına görə göy 3, 7, 9 qatlara bölünür, lakin etrusklarda və şamanist (qamçı) türklərdə isə göy 16, 17 bölümə ayrılır ki, bunlar da yaxın rəqəmlərdir. Etrusk və türk inancında evrənin vertikal 3 bölgüsü də uyğun gəlir: göy, yerüzü, yeraltı dünya. Bunların birindən digərinə keçid qapıları olan yol etrusklarda və altun (dəmir) kazıq isə türklərdə eyni mifik görüşlə bağlıdır.

Etruskların baş tanrısı Tin mühüm qərar verəndə 12 tanrı ilə gənəşir. İbn Fadlan başqord türklərinin baş tanrısı olan Göy tanrısının yaz iyəsi, qış iyəsi, su iyəsi kimi 12 iyə ilə anlaşmada olduğunu qeyd etmişdir. Oğuzların 12-lik sağ-sol boy sistemi etruskların 12 boy (şəhər-dövlət) qurumuna uyğun gəlir. Papaqları qırmızı olan türk qamlarının da qırmızı (qızılı) rəngi qutsal sayması etrusk gələnəyində təkrar olunur, zəfər simvolu sayılırdı. Burada *qızılbaşlar* yada düşür.

Azərbaycandan doğuya gedən türklərdə Baq (bağa) iyəadı zamanla Bağa, Bayat teoniminə çevrilmişdir. Etruskca *Paxa* teonimini göytürk yazılarındakı *Bağa tengri* deyimilə müqayisə etmək olar. Hər iki teonimin qaynağı bugünəcən Büsutun (qədim Baqastan) adında qalan Man, Mad elləri çağında

---

[72] *Арутюнян*, 1970, 169-170.

qədim Azərbaycanda işlənmiş Baq (Baqa) teonimidir. Baqa adı ilə bağlı etrusklarda bir də tanrılarla ilgisi olan Beqoya// Peke xanım (qadın) adı vardır ki, bu da Bəyim, Bikə anlamına uyğun gəlir. Bəzi ədəbiyatda bu xanımı etrusk törələrini təbliğ edən peyğəmbər kimi verirlər, lakin o, baş rahibə ola bilərdi, çünki heç bir xalqda qadın peyğəmbər olmamışdır.

Tit Liviy yazır ki, rəvayətə görə Romada seçkidən öncə başına qartal qonmuş Lutsiy Tarkviniy hökmdar seçilmişdir. Azər türkcəsində "başına dövlət quşu qondu" deyimi vardir. Qartalın qam deyimlərində "tanrı quşu" adlanması göstərir ki, qartal tanrının iradəsini, istəyini insanlara çatdıran qutsal quş sayılmışdır.

Yeni il tanrısı *Nortia* uğur və taleh hamisi idi. Hər Yeni il gələndə onun adına divara bir mıx çalarmışlar. Azərbaycan türk boylarında evə bir müddət görünməyən yaxın adamın gəlməsini sevinclə "durun divara bir çöp (mıx) çalın" - deyə, qarşılayırlar.

Etrusk boyları hər il mart ayında gənəşmək üçün bir yerə toplaşıb toy-bayram (qurultay) keçirirdi.[73] Bu törən qədim türk törəsinə, azər türklərinin Yaz (Yeni ıl) bayramına uyğun gəlir. Etrusk ölübasdırma gələnəyində kurqan kulturu, ölənin əlində kasa-cam və sair özəlliklər türk gələnəyilə üst-üstə düşür. Etrusk heykəl və rəsmləri incələyən tatar yazarı F. Latıpov onların görkəmcə azər türklərinə oxşadığını yazır.[74]

Urmu hövzəsinin güney bölgələrində m.ö.II minilin ortalarında yaranan atçılıq nəsnələrini ətraf ölkələrə yayan saqalar onları daha da təkmilləşdirdi. Örnəyin, yüyənin öncə tək olan ağızlığı (gəm) sonra bozqır yaşamına keçən saqalarda qoşa gəm forması almışdır, lakin etruskların İtaliyaya apardıqları gəmin ilkin forması orada uzun müddət davam etmişdir. Saqa

---

[73] *Немировский*, 1983, 112.

[74] *Латынов*, 1991, 116.

təsviri sənətində heyvan motivi (añ üslubu) adlanan üsulun öncə Urmu yaxasında formalaşıb və buradan Sibirə, Altaya, Azaq dənizi yaxalarına daşınması yozumu artıq sənətşünaslıq elmində mübahisə doğurmur. Artıq bu da bəllidir ki, Urmu hövzəsindən İtaliyaya da añ üslubu ilə yanaşı bir sıra başqa motivlər aparılmışdır. Örnəyin, türklərdə Tulpar, avropalılarda Peqas adlanan ***qanadlı at*** motivi Azərbaycanda m.ö.XI-X əsrə aid kasa üzərində qabardılmışsa, Etruriyada ona yalnız 5-6 əsr sonra rast gəlmək olur.



Qab üzərində *tulpar* rəsmi (Mərlik-təpə, m.ö.XI-X əsr)



Tarkvinidə «Ara Della Regina» məbədinin ön bəzəyi. Etrusk sənəti, m.ö. VI əsr.

Koroğlu obrasının prototipi haqqında sonrakı bölmədə bilgi veriləcəyini nəzərə alaraq burada Qıratın da bir tulpar olduğunu vurğulamaq gərəkir.

Romalıların hər il fevralın 18-də qurd-keçi (*lupus-hirkus*) ilə *luperkaliy* adlı törən keçirməsi türklərin *gökbörü* oyunu ilə çox yaxındır, hər ikisində keçi dərisindən istifadə olunur.

Qurdla bağlı bir neçə motiv üzrə etrusk-türk paralelləri var. Bunların sırasında atılmış körpələri dişi qurdun əmizdirməsi, bozqurdun savaş simgəsi kimi seçilməsi, yeni yurd salmağa aparan yolun bələdçisi olması, göydən işıqla düşüb bakirəliyi qorunan qızı hamilə buraxması önəmli yer tutur. Sadala-

nan bu dörd motivdən burada geniş danışmaq imkanı olmasa da, bəzi bəlgələri yada salmaq olar. Rus alimi D. Q. Savinov Sibirdə qayaüstü rəsmlər içində rast gəlinən qurd (it) cizgi şəkillərinin mənşəyini Qafqazla bağlayır.[75] Araşdırmalar bu doğru müşahidənin Etruriyada ortaya çıxan qurdla bağlı şəkil, heykəl və rəvayətlər üçün də keçərli olduğunu göstərir.


Etrusk bəzəyi, m.ö. VI əsr: qızıl həlqə üzərində qanadlı atlar. (Paris, Luvr muzeyi)

Qay Yuli Sezar kimi Romanın məşhur Qay ailəsi özlərini troyalı Eneyin soyundan sayırdı. Etrüsk əfsanəsində Eneyin törəmələri olan Romul və Remin sahibsiz qaldıqda onları bir dişi qurdun əmizdirib saxlamasından bəhs olunur. Bu olayın türklərin qayı boyunda da olması bəllidir. Hər iki olay təkcə sözlü qaynaqlarda deyil, həm də aşağıdakı türk və etrusk abidələri olan bəngüdaşlarda əks olunmuşdur:


Quzey Monqolustanda türk kağanına aid *börü başlı* 582-ci il abidəsi (S.Q. Klyaştornının çəkdiyi foto)


Oğlanı əmizdirən Börü. Etrusk başdaşı. (Çertoz başdaşından fraqment, m.ö. VI əsr)


Ekizləri əmizdirən dişi qurd (Etrusk heykəli)

---

[75] *Савинов,* 1980, 319.

Ekiz qardaşlara süd verən dişi qurd hekayəsi bu qurdu Roma şəhərinin simgəsinə çevirmişdir. Romanın salınması ilə bağlı başqa bir qurd əfsanəsi də var. Vaxtilə bunu qələmə almış Festusa əsasən G. Dümezil qeyd edir ki, Roma şəhərini salmaq üçün yola çıxanlara bir qurd bələdçilik edib onları şəhərin salınacaq Yedditəpə bölgəsinə gətirir.[76] Eyni hekayəyə başqord boylarında rast gəlmək olur, Nuhoğlu Türkün yolunu bəlirləyən bir qurd haqqında olan hekayəni isə azər türkləri içində qələmə almışlar.[77]






Qədim türk abidələrində oğlanı əmizdirən Börü: Költigin abidəsi (yuxarıda), Buqut abidəsi (solda), Bilgə Kağan abid. fraqment (sağda)

(C. Alyılmazın fotoları)

A. İ. Nemirovski yazır ki, Likofron etruskların soybabası kimi verdiyi Tarxon ilə Tirseni "Herakl soyundan törəyən qızılı-boz qurdlar" adlandırır.[78] Reya savaş tanrısı Marsdan (bozqurddan) hamilə qalır. Eyni durumu türk əfsanələrində görmək olur. Türk boylarının qoşduğu "Çingiznamə" dastanında Çingizin anası Alanqova hamilə olmasını "*gün işığı olub mənə yenir, qurd olub çıxır*"- deyə, izah edir. Bunu yoxlamaq qərarına gələnlər dan yeri söküləndə göydən işığın enib, sonra "*yılkı yallı gökbörü*" şəklində çıxdığını görürlər.

---

[76] *Ayda,* 1992, 99.

[77] *Sagitov,* 1986, 129; *ƏƏR,* 2005, 37-38.

[78] *Немировский,* 1983, 23.

Etrusklarda qurd savaş tanrısı Marsın bir simgəsidir. Bir etrusk cizgi rəsmində hətta tanrıca Menerva ilə olan uşaqlıq şəklindəki silah-yaraq və başı üzərində ulayan üçbaşlı qurd diqqəti çəkir. Etrusk yazılarında onun adı Maris, Mars, Mari şəklində keçir. Olsun ki, *mari* sözü elə börü anlamında işlənmişdir. Etruskların bu savaş tanrısı latınlara da Mars adı ilə keçmişdir.



Tanrıca Menerva ilə savaş tanrısı Mars

Bir sıra türk boylarının savaş simgəsi bozqurd idi. Uyğur Oğuznaməsində gün işığı ilə Oğuz xanın çadırına girən "*göy tüklü, göy yallı bir erkək börü*" Urum elinə yürüşdə oğuzlara yol göstərəcəyini bildirir. Oğuz xan da bozqurdu savaş uranı (çağrışı) kimi dəyərləndirib "*gökbörü bolsunğıl uran*"- deyir. Kuman boylarında da uran savaşa uğur gətirən bozqurd idi.

Rus salnaməsi kuman xanı Bonyakın 1097-dəki bir savaş olayından bəhs edir: "*i yako bist polunoşi i vstav Bonyak i otyexa ot rati i poça volçski vıti*".[79] Burada savaşöncəsi gecə Bonyak xanın çadırdan çıxıb bir az uzaqlaşaraq üzünü göyə tutub qurd kimi ulaması qeyd olunur. Həmin qaynaq olayın davamını belə verir ki, Bonyak səsinə bozqırdan hay verən bozqurdun cavabını eşidəndən sonra çadıra qayıdır və yarınkı cavaşda qələbə çalacağını deyir.

Göründüyü kimi həm etrusk, həm də bəzi türk boylarında savaş simgəsi bozqurd uran idi. Döyüş yaraqlarında qurd şəkili çəkilməsi və bəzi türklərin savaş bayrağına qurd başı taxması etrusk-türk savaş gələnəyinin doğal göstəricisidir.



Etrusklarda qurdbaşlı qalxan



Turfanda qurdbaşlı bayraq

[79] *Плетнева,* 1990, 102.

Qurdla bağlı əfsanələrin türk xalqlarinda yayğın olduğunu söyləyən ünlü sinoloq V. Eberhard haqlıdır.[80] Saxa türklərinin qurda *xallān uola* (göyün oğlu), *tañara uola* (tanrıoğlu) deməsi də bəllidir. Bu baxımdan, protoetrusk boyları içində hər hansı bir türk boyunun bozqurdla bağlı əfsanələri, motivləri İtaliyaya aparması bir tarixi gerçəklik kimi burada sadalanan örnəklərlə ortaya çıxır.

Ancaq Urmu teoriyasından xəbərsiz olan bəzi tarixçilər Ön Asiyadan türk boylarının doğuya, həm də batıya olan köçləri nəticəsində həmin bölgələrdə ortaya çıxan, eyni durumu əks etdirən bəlgələri yanlış yorumlayırlar. Örnəyin, tanınmış arxeoloq L. R. Kızlasov m.ö. I minilin son əsrlərində salınmış hunlara aid Taşebi şəhərinin arxitektur özəlliklərindən bəhs edərkən burada döşəməaltı isitmə sisteminin etrusk məbədlərinin *atrium* bölməsində isitmə ilə eyni tipdə olmasını və bu gələnəyin həm etrusk, həm də hunlara Ön Asiyadan aparıldığını yazır. Lakin qədim Sumer tikinti gələnəyində olan bu üsulu Taşebinə aparanların irandilli olduğunu söyləyir.[81] Əvvəla, hunların şəhərini nə üçün özləri yox, irandillilər tikməli idi? Həmin məntiqlə İtaliyadakı etrusk məbədlərini də o çağlarda hələ tarix səhnəsinə çıxmayan irandillilər tikməli idi ki, bu da absurd yorumdur, çünki nə Altayda Taşebi şəhərini tikən hunların, nə də m.ö. I minilin başlarından İtaliyada görünən etruskların içində irandilli olmamışdır.

Bu bölmədə etrusk-türk əlaqəsinə işıq tutan bəzi bəlgələr üzərində ötəri dayansaq da, etrusk xalqının formalaşmasında iştirak edən protoetrusk boylarından birinin türk kökənli olub da, toplumda üstün mövqe tutması çox aydın görünür. Sonrakı bölmələrdə bu görüntünü sərgiləyən bəlgə sayı daha çoxdur.

---

[80] *Eberhard,* 1942, 87.
[81] *Кызласов,* 2006, 190-196.

# ETRUSKLAR VƏ SAQA-QAMƏR BOYLARI

Protoetrusk boyları içində görünən türk boyunun ilkin atayurdu Azərbaycan olduğu kimi, Altaydan Azaq dənizinəcən uzanan bozqırlarda at oynadan saqa (skit) boylarının atayurdu da Azərbaycandır. Buradan m.ö. II minildə saqa, qamər (kimer) adı ilə çıxan türk boylarınin bir hissəsi sonralar geri qayıtdı və m.ö.VII əsrdə Azərbaycanda Saqa elini (dövlətini) qurdu, Doğu Anadoluda Qamər bəyliyi yarandı.[82] Qamərlər vaxtaşırı Anadolunun batı yaxalarına yürüşlər edir, Friq və Lidiya bölgələrini yağmalayırdılar. Bu bölgələrə saqa boyu da zaman-zaman atlı ordularla girib yağmalar etmişdir.

Bu çağlarda və ya daha əvvəllər saqa-qamər boylarının içindən bəzilərinin tirsen, yaxud başqa protoetrusk boyları ilə əlaqəsi yarana bilərdi. Vaxtilə florensiyalı monax Mariano etrusklar haqqında yazdığı traktatda özəlliklə vurğulayırdı ki, Nuhoğulları yerüzünə yayılanda Qamər (Qomer) Etruriyada məskunlaşdı.[83] Etrusk və qamər katakomb dəfn adətlərinin oxşarlığı da artıq alimlərin diqqətini cəlb etmişdir. Beləliklə, etrusk və saqa-qamər boyları arasında oxşar durumların olmasını sərgiləyən birbaşa və dolayı bəlgələrlə tanışlıq bu yöndə araşdırmaların davam etdirilməsinə zəmin yaradır.

Etruskların dini görüşlərilə bağlı qladiator gələnəyi sonralar romalılarda mahiyətini dəyişdi, lakin Herodotun saqa yas törəni və əsrlərdən birinin qurban verilməsi haqqında verdiyi bəlgələri oxuyanda, bir tərəfdən etrusk qladiator döyüşündə məğlub olanın qurban verilməsi yada düşürsə, digər tərəfdən də saqa-türk gələnəyində basırıq ətrafında dikələn balballar göz önünə gəlir. Belə ki, hər üç durumda basırıqda yatan ada-

---

[82] *Ağasıoğlu*, 2006.

[83] *Немировский*, 1983, 4.

ma obiri dünyada xidmət edəcək insan qurbanı (onu təmsil edən balbalı) eyni məqsəd daşıyırdı.

Bizans qaynağında bir bəlgəyə görə, Göytürk xaqanının *skit hərflərilə* yazılmış məktubunu Bizansda tərcüməçi oxumuşdur.[84] Deməli, göytürk runik yazısının saqa (skit) hərfləri adlanması gələnəyi hələ göytürklər çağıncan qalmışdı.

Etrusk soylu Vergili doğma yurdu Mantuya yönəlik belə söyləyir ki, orada üç ayrı-ayrı soyun hər birindən dörd uruq vardı.[85] Onlara daha təpərli etruskların rəhbərlik etməsini də vurğulayan şairin bu deyimi, görünür, Etruriyada yayılmış 12-lik (3x4) sistemilə bağlıdır. İç və dış oğuzlar da 12 (3x4) boya ayrılırdı.

Qədim türk törəsinə görə, hər türk boyu el (dövlət) qura bilməzdi. El qurma imtiyazı Bozuklara verilmişdi, Üçoqlar da onlara tabe olmalı idi. Arabir bu törə pozulurdu və onda türk boyları arasında münasibət də pozulur, dərəbəyliklər meydana çıxır, etimadsızlıq yaranırdı. Ona görə qədim türk toplumunda "el pozular, törə pozulmaz" deyimi vardı, törə qudsal sayılırdı. El qurma səlahiyəti olan boyların sırasında qayı boyu başda gəlir.

KDQ-da hakimiyətin yenidən *qayı* boyuna qayıdacağı vurğulanır, çünki oğuzların bozuk qolundan olan ***qayı*** boyu türk elqurumu gələnəyinə görə qədim çağlardan dövlət qurub onu idarəetmə hüququ qazanmışdı. Osmanlı xanədanı soykökünü bu boya bağlasa da, əsl qayı kökənli Gündüz Alpın soyundan olanlar, özəlliklə qarakeçili türkmənlər doğu və güney-doğu bölgələrə çəkilmiş, Amuca soyu isə Balkanlara sürgün olunmuşdur.[86]

---

[84] *Ligeti,* 1986, 62.

[85] *Вергилий,* «Энеида», X. 201-203.

[86] Topqapı muzeyində saxlanan qədim bir qılıc üzərində qayı boyunun damğası var, lakin onu Xəlifə Osmanın qılıcı kimi təqdim edirlər.

Oğuznamə gələnəyi bozuq boylarının içində Gün xanın soyundan ***qayı*** boyunu el (dövlət) qurmaq hüququ olmasını vurğulayır və bu boyun damğasını **IYI** və **IVI** kimi verir. Bu damğaya qayı boyunun köç etdiyi yerlərdə rast gəlmək olur. Bir saqa kurqanından (m.ö.VI əsr) çıxan altun sadağın üzərində maral qabartması var. Maralın boynunda qayı boyunun damğası naxış kimi sıralanmışdır:



Saqa basırığından (m.ö.V əsr) çıxan altun sadaq üzlüyünün bir hissəsi



Kayı boyunun damğası

Tarixi qaynaqlarda adı çəkilən *kaysak* boylarının qazax-qırğız xalqlarının təşəkkülündə önəmli yeri olmuşdur. Bu boyadının tərkibində *kayı* (qayı) və *sak* (saqa) etnonimləri görünür.[87] Olsun ki, Herodotun **baş-el* anlamında elbəyi saqaları *basileyi skithai* adlandırması dış oğuzların (saqaların) Orta Asiyadakı kaysak boylarını da bildirirdi, çünki *qayı* boyu elbəyi statusunda olan boylardan idi. Görünür, Saqastanda (indiki Sistan) ortaya çıxan *kay* (Key-Xosrov, Key-Qubad,

[87] *Koroqlı,* 1983, 14.

Key-Kavus) və etrusklardan latınlara keçən *qay* titulu qədim etnososial türk gələnəyilə bağlıdır. Romada Qay sülaləsinin və Roma imperatoru Qay Yuli Sezarın özünü troyalı Eneyin soyundan sayması türk-etrusk bağı baxımından önəmli tarixi bəlgədir.

Maraqlıdır ki, 251-də imperator olmuş iki qardaşdan biri *etrusk*, digəri *kayı* soyadı ilə qeyd olunur, halbuki hər ikisi Roma imperatoru Deciusun oğlu idi: *Imperator Caesar Quintus Herennius Etruscus Messius Decius Augustus; Imperator Caesar Caius Valens Hostilian Messius Quintus Augustus.*

Etrusk-saqa paralelləri sırasında Herodotun qələmə aldığı *traspi* (tiras-pi) boyadı, *Targitay* şəxsadı etrusklarda *tirsen* boyadı və *Tarxetiy* çəxsadı kimi qarşımıza çıxır. Bu sıraya Pelek adını da əlavə etmək olar. Belə ki, bir etrusk epitafiyasında *Pelek klan* (Pelek oğlu) sözləri vardır. *Palak* şəxsadına saqa elbəylərindən birinin adında rast gəlirik. Hətta m.ö.II əsrdə yaşamış bu caqa elbəyinin atlı heykəli qalmışdır:



Saqa elbəyi **Palak** (m.ö. II əsr)

Pelek//Peleg adının anlamı Tövratda belə izah olunur ki, İbrahim peyğəmbərin ulu babalarından biri Pelek adlanırdı və onun vaxtında torpaqlar yenidən bölündü.[88] Göründüyü kimi, söhbət burada bölünməkdən gedir və Pelek adının "bölək" anlamı daşıması aydınlaşır. Lakin etrusk-saqa adı kimi bəlgələrə düşən Pelek//Palak adı qədim türkcədəki *balaq* və ya "ərmağan" anlamında olan *belek* sözündəndir.

Elmi ədəbiyyatda skith (saqa) sənəti kimi dəyərləndirilən *animal stil* (añ üslubu) motivlərində incə zövqlə verilmiş añ

[88] Ağasıoğlu, 2009, 115.

(heyvan) şəkili, fiquru gərgin durumu ilə seçilir. Buradkı dinamik hərəkət elə ustalıqla stilizə olunur ki, onu başqa sənət əsərlərilə dolaşıq salmaq mümkün deyil. Saqa-türk boylarına məxsus añ üslubunda hazırlanmış sənət əsərlərinin, bu üsluba xas motivlərin Etruriyada ortaya çıxması açıq gösərir ki, həmin boylardan etrusk toplumuna qatılanlar vardı.



Etrusk sənəti



Saqa sənəti

Bu etrusk qrifonu ilə saqalara aid Pazırıq xalısında olan qrifon sanki bir sənətkarın əlindən çıxmışdır.[89] Altayda tapılan Pazırıq xalısının m.ö.V əsrdə Qarabağda toxunduğunu yazan alman xalçaşünasları haqlıdır. O çağda Azərbaycandakı Saqa dövləti dağılsa da, sonralar onun yerində yaranmış Alban elində saqa boyları yaşayırdı və Alban çağında yaranmış su qabları ilə etrusk su qabları arasındakı bənzərlik daha qədim gələnəyə bağlanır.



Etrusk (solda) və Alban su qabları





Etrusk (solda) və Alban keramik su qabları

Göründüyü kimi, etrusk və türk (saqa-qamər) bağı adi məişət nəsnələri olan su qabları fiqurlarının müqayisəsi ilə də ortaya çıxır. Belə bəlgələri təsadüfi oxşarlıq saymaq olardı, lakin başqa sənət örnəklərinin, özəlliklə añ üslubunu əks

---

[89] *Ağasıoğlu,* 2008, 21.

etdirən sənət əsərləri arasındakı bənzərliyi isə gözardı etmək mümkün deyil, çünki saqalara aid bu üslubun Ön Asiya mənşəli olması artıq elmdə mübahisə doğurmayan məsələdir. Bu da nəzərə alınmalıdır ki, indiyəcən saqa-türk sənəti sayılan añ üslublu örnəklərin təhlilində etrusk bəlgələri kənarda qalmışdır.

Saqa-türk Etrusk





Ön Asiya mənşəli süjeti əks etdirən hər iki bəzək m.ö. IV əsrə aiddir. ↑ Güney İtaliya ↓ Taman yarımadası



Verilən bu örnəklərdən də göründüyü kimi, eyni motiv, eyni qrifon Ön Asiyadan bir ucu Altay, bir ucu İtaliya, bir ucu da Azaq-Qaradəniz yaxalarında ortaya çıxan nəsnələr üzərindədir. Tarixi qaynaqlar, rəsm əsərləri at üzərində döyüşçünün çevrilib geri ox atması motivini etrusk-türk bağı kimi qarşımıza çıxarır. Belə ki, belə savaş taktikası yalnız saqa-qamər, hun, kuman və sair türk atlılarına məxsus olan bir üsuldur və bunun etrusk sənətində də özünü göstərməsi türk-etrusk əlaqələri baxımından çox önəmli, həm də tutarlı bir tarixi bəlgədir. Etrusklarla saqa-qamər boyları arasında olan əlaqəni daha qədim mifoloji bəlgələr də ortaya çıxardır.

## KOROĞLU - HEREKLE BAĞI

Prototürklərin atayurdu Urmu hövzəsində m.ö. II minilin başlarında ortaya şıxmış Koroğlu mifi sonralar Anadolunun *Tuman, Kaşkay* və *Palu* (Bolu) adlanan orta bölgələrində, Azərbaycanda və Tükmən elində dastan (epos) formasında gəlişmişdir. Eposun türkmən və azər boyları içində yaranmış variantlarında Koroğlu obrazı ilə bağlı motivlərin saqa və etrusklara aid bəlgələrdə buraxdığı izləri tapıb çözmək gərəkir.

Hələ 2500 il bundan öncə saqa boylarının soykökü miflərini qələmə alan Herodot yazırdı ki, saqaların Targitay adlı soybabası onların üzərinə pers şahı Daranın yürüş etdiyi ildən (513) min il öncə yaşamışdır, bu da m.ö. II minilin ortalarında Koroğlu mifinin dastanlaşdığı dövrə düşür.

Herodot soykökü miflərindən birini Qara dənizin quzey sahillərində yunan kaloniyalarından toplamış, o birini isə saqaların özündən eşitmişdi. Birinci mifdə saqaların soybabası Herakl, ikinci mifdə isə Targitaydır.[90] Birinci variantdakı mifin qısa məzmunu belədir:

Herakl itirdiyi inəkləri axtara-axtara gəlib "ağaclıq" adlanan *Gileya* bölgəsinə çatır. İnəkləri buradakı yarı ilan, yarı qız olan bir pəri mağarada gizlətmişdir.[91] Herakl ilə yaxınlıq edəndən sonra inəkləri qaytarır. Herakl gedərkən yayını və kəmərini doğulacaq oğlanları üçün əmanət qoyur və pəriyə tapşırır ki, hansı oğlu yayı onun kimi qullana bilsə, qılıcını asdığı kəməri onun kimi belinə bağlaya bilsə, o oğlu ölkənin başçısı olsun.

---

[90] *Herodot,* IV. 5-7; IV. 59.

[91] Qədim Anadoluda bir hat mifində tufan tanrısı *Taru* ilə ilan arasındakı savaşdan bəhs olunur. Burada ilan *illuyan-kas* (ilan-qız) kimi təqdim edilir (*ИДВ,* 1988, 156). Bu bölgə Koroğlunun eposa çevrildiyi Bolu bölgəsinin qonşuluğundakı ərazilər idi və o çağlarda burada *qaşqay, urmu* və başqa türk boyları da yaşayırdı.

Vaxt tamam olanda İlanqız üç oğul doğur: Aqathirs, Gelon və Skit. Heraklın qoyduğu şərtə kiçik qardaş Skit (Saqa) əməl edə bilir, hakimiyət ona verilir. Qardaşlardan törəyən boylar onların adını daşıyır: *aqathirs*, *gelon*, *skit*. Beləliklə, saqaların ümumi adı Heraklın kiçik oğluna bağlanır.

İkinci variantda saqaların soybabası Heraklın adı Targitay kimi verilir. O da *Papay* ilə *Apinin* oğludur. Aşmarin qeyd edir ki, çuvaş dilində "baba tanrı" anlamında *papay, tură papay* deyimi işlənirdi. Həvva "Qutatqu bilik"də *Apa* adlanır: "*Apa yazdı ersə, Bayat qınadı*" (Həvva azdı, tanrı onu qınadı). Qohumluq termini kimi "ulu" anlamında *Apa* sözü həm türk, həm də etrusklarda adlara qoşulur.

Saqa mifologiyasına görə *Targitay* Ulu Baba ilə Ulu Anadan doğulur. Etrusklarda da *Tarxitiy* adı vardı. Targitay adına bir də Herodotdan minil sonra 584-də Feofilakt Simokattanın əsərində avar boyunda tanınmış bir bəyin adında rast gəlirik.[92] Beləliklə, bu mifdə adı keçən *Papay, Api,* onların oğlu *Targitay* türkcə adlardır. Targitayın da üç oğlu olur: *Lipoksa(is), Arpoksa(is), Kolaksa(is).*

Rəşidəddinin qələmə aldığı "Oğuznamə"də türk hökmdarı Buğra xanın oğlanları da belə adlar daşıyır: *İltegin, Bektegin, Költegin.*[93] Buğra xan hakimiyəti qardaşlardan "sanlı" olan Költeginə verir. Saqa elinin ilk hökmdarı da *Kolaksa* olur, sınaqdan adının mənası "adlı-sanlı" anlamında olan bu kiçik qardaş keçə bilir. "Koroğlu" eposunun Türkmən variantında Cıqalı bəy də sultanlığı kiçk öğlu Adıbegə verir. Türklərdə elbəy, xaqan oğullarına *tegin, şad* ünvanı (titul) verilməsi gə-

---

[92] *Simokatta,* I. VI, 4-5; I. VIII, 7; VI. XI, 6; Rubruk da Skatay adlı tatar xaqanından bəhs edir. Burada *saka-tay* tərkibinin skatay kimi verilməsi diqqəti çəkir.

[93] Költeginin adı yanlış olaraq Qorıtegin yazılmışdır. V. Bartold və O. Turanın yorumuna əsasən *kür* və *külüg* sözlərinin kökündə *kü-* sözünün olduğunu deyən A. Donuk yazır: "*Kür* sözü eyni zamanda *l~r* ilişkisi göz önündə tutularaq, türk söz-terminləri arasında çox sıx keçən *kül* deyimi ilə bağlantılı sayılmaqdadır" (*Donuk*, 1988, 80).

lənəyi bəllidir, Buğra xanın oğlanları da tegin ünvanını daşıyır. Türkmən dilində tegin (bəyoğlu, bəyzadə) anlamında *bekce* sözü işlənir. Kolaksanın qardaşları adında da həmin *bekce* sözü vardır: Li-bek-ce, Ər-bek-ce.

Beləliklə, Buğra xanın oğlanlarının adı ilə paralellik sərgiləyən Targitayın oğlanlarının adını yunan əlifbasında *c, ç, ö, ə* hərfləri olmadığını və il > li metateza hadisəsini nəzərə alıb belə bərpa etmək mümkündür:

| Oğuznamə | Herodot |
|---|---|
| *İl - tegin* | * *İl - bəkcə* > Lipok-sa |
| **(Ər) Bek - tegin* | * *Ər - bəkcə* > Arpok-sa |
| * *Köl - tegin* | * *Köl-əkcə* > Kolak-sa |

Bir saqa kurqanından çıxan gümüş qab üzərində Targitay və üç oğlunun təsviri verilmişdir. Burada türk dövlətçilik gələnəyinə uyğun olaraq Targitay hakimiyyət simvolu olan yayı kiçik oğlu Köləkcəyə verir:

Gümüş qab üzərində Targitay və üç oğlu



(Voronej yaxınlığında saqa kurqanı)



Elbəkcə (*İlpoksa*) Targitay



Ərbəkcə (*Arpoksa*) Targitay



Köləkcə (*Koluksa*) Targitay

İkinci soykökü mifində üç qardaşdan *avxat, katiar, traspi, paralat* boyları törəyir və bunlar elliklə *skolot* (sakelatı) adlanır. Hər iki mifdə adı keçən saqa boylarının etimologiyasına burada toxunmasaq da, örnək üçün birini gözdən keçirək. Tirsen (etrusk) adından danışanda Targitay soyundan gələn traspi (*tiras-pi*) boyadı üzərində dayanmışdıq, indisə Roma şəhərini salan Romulun anası Reyanın "meşəli" anlamında olan *silviya* soyuna uyğun gələn *aqathirs* boyadına baxaq.

Herodot meşəlik (ağaclıq) bölgədə yaşayan, qızıl nəsnələri çox sevən *aqathirs* boyunun qonşuları traklara oxşadıqlarını yazır. Sonrakı qaynaqlarda hunların içində "skit boyu" kimi verilən *akatsirlər* ('ακατζιροι) türkoloqların doğru olaraq göstərdiyi kimi, türk yurdlarında çoxlu izi qalmış *ağacəri* boyudur.[94] Göründüyü kimi, saqaların bu boyadı da yunan dili süzgəcindən keçməsinə baxmayaraq bəzi türk elementlərini saxlamışdır.

Göründüyü kimi, Herodotun saqaların özündən eşitdiyi bu variantda adlar türkcədir.[*] Herodotun qələmə aldığı hər iki mifdəki saqa soykökü variantlarını belə sxemlə göstərmək olar:

**Herakl**
- → **Agatirs** (*ağacəri*)
- → **Gelon** (*gelon*)
- → **Skith** (*saqat*)

**Targitay**
- → **Elbek** (*avxat*)
- → **Arbak** (*katiar, traspi*)
- → **Kolak** (*paralat*)

---

[94] *Гейбуллаев*, 1991, 294; *Zakiyev*, 1998, 165.

[*] Bu etimoloji bərpa analoji paralellərlə və daha geniş yozumla "Qədim Türk elləri. Saqa-qamər boyları" adlı kitabda verilmişdir (*Ağasıoğlu*, 2007).

Türk və İran folkloru üzrə tanınmış uzman Xalid Koroğlu yazır ki, Rüstəm və Koroğlu bars (pantera) dərisi geyinmiş bahadırlardır.[95] Antik çağ sənət əsərlərində Herakl əlində dəyənək, çiyninə aslan dərisi atmış şəkildə təsvir olunur. Lakin yunanların yaşadığı bölgədə aslan yoxdur, onun adını (**lew*) avropalılar sami xalqlardan alıb işlədirlər. Bu durumda Heraklın aslanla vuruşmasına, aslan dərisi geyinməsinə yorum vermək çətindir. Avropalı uzmanlar qeyd edirlər ki, Herakl yunan mifologiyasına dışarıdan gəlmişdir.

Bəzi azər dialektlərində Aslan adı *Asdan* kimi deyilir və bunu qazax-qırğız dilindəki *arstan//arıstan* formalarında da görmək olur. Söz başında "*a*" səsi olmayan rus dilinə keçən *Arıslan* adı bu dildə *Ruslan* şəklinə düşür. Həmin ad "*l*" səsi olmayan qədim pers dilində də *Rustan//Rustam* formasını almışdır. Əslində, Sakastan (Seistan) bölgəsində formalaşan və Koroğlu ilə bağlanan Rüstəm obrazı da saqa (türk) boyundandır. Bu nədənlə onu V əsr hay yazarı M. Xorenatsi *saqcik*, Təbəri isə *bin türk* (türkoğlu) adlandırır.

Koroğlu Dərbənd səfərində yatarkən atı itir. Onu tapdıqda hökmdarın qızı ilə evlənir, ondan Qurdoğlu adlı oğlu olur və Herakl kimi Koroğlu da doğulacaq oğluna əmanət buraxır. Dastanda deyilir:

Koroğludu atan zatı,
Bazubəndi amanatı,
Çənlibeldə var busatı,
Allaha tapşırdım səni.

Göründüyü kimi, *atın//inəyin itməsi* olayı evlənmə, əmanət qoyma, oğlu doğulma zəncirinin başlanğıcıdır. Bu motivin türk eposlarında önəmli yeri vardır. Xakas eposunda Çis Sibildey adlı pəri Altın Çaqanın atlarını oğurlayıb onu özünə cəlb etmək və Yeraltı dünyaya aparmaq istəyir. Belə para-

---

[95] *Короглы,* 1983, 37.

lellərin tipologiya ilə izahını mümkün saymayan M. İ. Borqoyakova görə buradakı motiv və süjetlərin, kiçik detalların belə, bənzərlik və eyniliyini təsadüf hesab etmək olmaz.[96]

Herodotun topladığı Targitay//Herakl variantlarında soykökü motivi qabarıq verilir; hər ikisi saqa boylarının soybabasıdır. Lakin Koroğluda bu arxaik motiv bir-iki epizodik elementdə qalmışdır. Oğlunun *Qurdoğlu* adlanması soykokü mifilə bağlı etrusk və qədim türklərin bəlli bozqurd əfsanəsini xatırladır. Folklor uzmanı Elxan bəyin mənə dediyinə görə, mağarada qurdun Koroğlunun oğluna süd verməsi epizodu folklorda vardır. Hər halda, üç minil öncə Koroğlu motivlərini Kiçik Asiyadan İtaliyaya aparan etrusklar oğlana qurdun süd verməsi mifini də oraya daşımışlar.

Poladlı boyundan toplanan "Qıratın qaçırılması" qolunda söylənmiş "*Koroğlu dədədir, çıxma sözündən! Nəslimiz kəsilər torpaq üzündən*" deyimi Koroğlunun əcdad kultu ilə bağlı olduğunu ortaya qoyur.[97] Eposda "*Adım Rövşən, soyum Koroğlu*" deyimi də bunu təsdiq edir.

V. A. Karrıyevə görə, Azərbaycan-Qafqaz variantından fərqli olaraq, Türkmən-Özbək variantında epos Koroğlunun doğulması (*Qöroqlının döreyişi*) motivi ilə başlanır. Yazar epik qəhrəmanın qəbirdə doğulması epizodunun qədim dövrlərdən yerli epik motiv olduğunu da qeyd etmişdir.[98]

Koroğlu eposunu türk-saqa boylarından alan xalqlarda bu epos iki əsas varianta - Azərbaycan və Türkmən variantına dayanır. Variantlar arasında ən önəmli fərq azər variantında olmayan, lakin daha qədim motivləri saxlayan türkmən variantında Koroğlunun doğumu və ərsəyə çatıb yetgin bahadır kimi tanınması səhnələrini əhatə edən birinci bölmədir.

---

[96] *Раевский*, 1985, 214.

[97] *Vəliyev*, 1979, 4.

[98] *Каррыев*, 1968, 140; Goroğlu hamilə ikən ölən anasının qəbrində doğulur.

Herodotun saqa boylarının soybabası kimi verdiyi Herakl yunan mifologiyasında Olimpin baş tanrısı Zevsin dünya gözəli Alkmenadan doğulan oğludur. Alkmenaya qızan Zevsin arvadı Hera balaca Heraklı öldürmək üçün zəhərli ilan göndərir, lakin körpə bu ilanı tutur və boğub öldürür. Azərbaycan türkcəsində isə bu olayla bağlı hələ dil açmamış körpəyə *ilanboğan vaxtıdır* deyimi qalmışdır.



Zevs cocuğu təhlükədən xilas etmək üçün Hera yatarkən onun döşündən Herakla süd içirdir, bu olayda Hera artıq "süd anası" sayıldığı üçün Herakl ölümsüz yaşam qazanır. Əsl adı *Alkid* olan bu bahadıra sonra *Herakl* ləqəbi (adı) verilir. Saqa, azər, türkmən və etrusk miflərində keçi südü ilə həyatda qalma, dirilik suyu və ya tanrıca südü içməklə təpərli, ölümsüz olma motivləri Koroğlu-Herekle eposunda və sənət əsərlərində əks olunmuşdur:




Saqa qızıl düyməsi Kuloba kurqanı, m.ö.IV

Saqa xalça rəsmi Pazırıq kurqanı, m.ö.V

Herklenin südəmmə olayı Etrusk güzgülərində

Herakl Heranın südünü içir. Vaza üzərində rəsm

Herkulanum divar rəsmi, m.ö. I

Azərbayçan variantında Koroğlu Qoşabulaq suyundan içib təpər alır,köməyə ehtiyacı olanlara yardım edən bahadır olur. Türkmən variantında isə gorda doğulan Koroğlu deşikdən çıxaraq keçi (at) südü içib diri qalır. Körpənin keçini əmməsi

olayı 2000 il öncə vulkan altında qalmış Herkulanum şəhərinin divar rəsmində əks olunmuşdur. Buradakı uşaq Heraklın özü deyil, oğludur. Qədim döşəmmə motivi Türkmən, Yunan və Etrusk variantlarında, dirilik suyu içmə isə azər-saqa variantında özünü göstərir. Etrusk güzgülərinin arxasına çəkilmiş yuxarıdakı rəsmlər tanrıca döşündən südəmmə olayını əks etdirir. Hətta, bir güzgüdə bu olaya aid yazı da vardır.

Etrusk dilində olan bu yazıda Koroğlu adını etruskoloqlar Xerkle şəklində oxuyurlar. Lakin buradakı işarə o biri etrusk yazılarındakı kimi (h), yaxud (k) kimi, *klan* şəklində yazılan söz də *oklan* kimi oxunmalıdır Sağdan sola oxunan bu yazının sırasına görə transkipsiyası, oxunuşu və anlamı belədir:

:ƎƆƧ:AƆOИAVƆ:VAIИV:ƎVƆƆƎ8:ƆAИ↓I:A↑T:ИƎOƧ:AƆƎ

**eka sthen tka içnak herkle unial klan thura ske**

Eka s(ü)ten tka iqnak Herekle Unial (o)klan turaske

*Burada südün tka içən Geroqılı (tanrı) Ananın oğlu turadı*

A. Ayda bu yazı haqqında bilgi verməsə də, tanrıcanın sağ döşünü Herklenin əmməsilə şaman duasında Humay anaya xitabən "*Bizi sağ ovcunda oynat, sağ məmənlə bəslə*" deyimi arasında paralelliyi qeyd etmişdir.[99]

Türklərin Atayurdunda yaranmış Koroğlu obrazı, motivləri o qədər populyar olmuşdur ki, hətta Aralıqdənizi bölgələrinə də yayılmış, batıya gedən motivlərin yeni çalarları yaranmışdır. Selevkilərin çağında Herakl adı ilə Azərbaycana qayıdan Koroğlu obrazına Həmədan yolundakı Büsutun qayasında bir heykəl də yapıl-


Büsutunda Heraklın heykəli

[99] *Ayda,* 1992, 81-83.

mışdır. Maraqlıdır ki, Azərbaycandan aparılan bu bahadırın obrazını İskəndərin Ön Asiyaya yürüşü ilə vətəninə yeni adla qaytarmışlar.




Etrusk toplumunda bu bahadırın daha populyar olması diqqəti çəkir. Belə ki, etrusklardakı Herekle bir sıra olaylarda iştirakı ilə yunan Heraklesini təkrar etsə də, onunla bağlı yalnız etrusk toplumuna məlum olan motivlər də güzgülərdə əks olunmuşdur. Örnəyin, bir neçə güzgüdə Minerva ilə yanaşı verilməsi onu bu tanrıcanın sevgilisi kimi təqdim edir ki, bu motiv yunanlarda yoxdur.

Koroğlu adını "kor kişinin oğlu" semantikası ilə təqdim edən Azərbaycan variantından fərqli olaraq Türkmən variantı həm də adın ilkin semantik tutumunu mühafizə etmişdir. Bu adın müxtəlif türk boylarında Koroğlu, Qöroqlı, Keroqlı, Koruqılı, Kuroqlı və sair bu kimi müxtəlif fonetik variantları yaranmışdır. Koroğlu adının başqa dillərdə də xeyli fonetik variantı ortaya çıxmışdır. Bu adın rus qrafikası ilə *Gierokle* (Гиерокле) şəklində verilən yunanca *Hierokle* (Ἱεροκλή) yazılış variantı da vardır. Batıda bu adın sonralar *İrakli* variantı da yaranmışdır.

Herodot yazır ki, saqalar əcdadları uyuyan məzarlığa *Gerr* deyirlər. Bunun *gor* sözü olması mümkündür. Sumer inanışına görə *Kur* ölənlərin kölgəsi yaşayan yeraltı məkandır və tanrıca Ereşkiqal buranın sahibidir. Doğu türklər obiri dünyanın ağasına *Erlik* deyir. Koroğlu gorda, yeraltı dünyada doğulur. Bu mifik qəhrəman türkmən variantında *Qöroqlı* (gor-oğlu) adlandığı kimi, tacik variantında da onun goroğlu (*qur-zad*) epiteti vardır. Herakl kimi öncə başqa adı olan bu uşağa Goröğlu adını övliyalar verir. Koroğlu-Herakl adının

ilkin semantikasını tapmaq üçün onun etimolojisinə baxmaq gərəkir. Bu adın müxtəlif dillərdəki fonetik variantlarını alt-alta düzəndə onun ****goruqulı*** praforması alınır:

| | |
|---|---|
| Dialekt variantları | Quroqlı, koruqılı |
| Türkmən | göroqlı |
| Tacik | qurquli, quruqli |
| Azər, Türk | koroğlu |
| Tavola Oska | hereklu |
| Etrusk | kurugile, herekle, herkle |
| Yunan | herakles |
| Latın | herkules |
| Praforma | ***goruqulı** (gor oğlu) |

Beləliklə, Koroğlu adının etimologiyası adın "Gor oğlu" anlamında olduğunu ortaya çıxardır və Türkmən variantının qədimliyi linqvistik baxımdan bir daha təsdiq olunur. Linqvistik təhlil Koroğlu adının yunan, latın, etrusk dillərindəki variantlarının da (*Heraklus, Herkules, Herekle, Hereklu*) ***Gor-oqulı** praformasından yarandığını ortaya qoyur. Hətta Atlant ilə birlkdə rəsmi olan bir etrusk güzgüsündə onun adı **Kurugile** kimi yazılmışdır:

HERAKL və ATLANT motivi
Etrusk güzgüsü (fraqment)




Göründüyü kimi, batıya sızan Koroğlu mifilə bağlı motivlərdə dəyişmələr yeni çalarlarla zənginləşsə də, bir sıra fərqli motivlər yaransa da, mifik bahadırın adı dəyişməyib, kiçik fonetik fərqlərə uğramışdır.

Koroğlu-Herakl mifi və eposunun eyni qaynaqdan olmasını ortaya qoyan özəlliklərdən biri də eyni motivlərin

ortaq struktur elementləridir. Burada belə elementlərdən geniş bəhs olunmasa da, toxunduğumuz bəzi ortaq motivlərin qısa özətini vermək olar:

Mifin struktur elementləri

1 *a)* Yeraltı dünyada (Gorda) doğulma

*b)* Göy-Yer iyələrinin (Papay-Api) və Zevslə Yer gözəli Alkmenanın oğlu

2 *a)* Qoşabulaqdan su içib bahadır olur

*b)* Ana ilahənin südünü içib ölümsüz olur;

2-ci variant: keçi südü içib diri qalır

3 Xilaskar missiyası daşıma, köməyə ehtiyacı olanlara yardım, Xalqın ən sevimli qəhrəmanı, geyimi aslan (bars) dərisi

4 Yatarkən inəyi//atı itir, onu saxlayan qadından (pəri, hökümdar qızı) oğlu olur

5 Oğlu üçün əmanət (qolbağı-bazubənd, kəmər və yay) qoyur

6 Koroğlu və Herakl adı sonradan verilən ikinci addır

7 Koroğlu-Herakl adlarının morfonoloji bərpası *Goroqulu (*Gor-oqlu*) praformasını verir

8 İlk xanımlarının adı: *Nigar(a)* və *Megara*

9 *a*) Soykökü motivində soybabasıdır

*b*) Hakimiyyəti kiçik oğluna verir

Türkmən variantında Koroğlu "*Meniñ aslı kərim xəzirbeycanlı*" desə də, olaylar təkə-türkmən boylarının yurdlarında cərəyan edir. Uzaq səfərlər İsfahan, Gürcüstan, Anadolu və başqa bölgələrə yönəlir, lakin olaylarda daha çox Araz çayının sağı-solu yer alır, Qaf (Qafqaz) dağı, Şirvan, Xəzirbeycan (Azərbaycan) adları hallanır. Türk-Azər variantında Koroğlu eposunun coğrafiyası Qafqaz, Güney Azərbaycan və Anadoludur. Bu coğrafi adlar da göstərir ki, Koroğlu mifinin mənşəyi Ön Asiyadır. Mifin epos variantı Azərbaycandan Anadolunun

orta bölgələrinə uzanan ərazilərdə ərsəyə gəlmiş, onu buradan İtaliyaya etrusklar, Skitiyaya isə saqalar aparmışlar

Anadolunun quzey-batı tərəfində Koroğlu sıra dağlarının Bolu (qədim *Pala*), Eregli (keçmiş *Hirakle*) bölgəsində olması göstərir ki, yunan mifologiyasında Herakl obrazının prototipi olan Koroğlu ilə bağlı rəvayətlər burada *qaşqay eli* (m.ö. II minilin ortaları) dönəmində yayılmışdır. Amazonka, İlanqız, Təpəgöz və Troya ilə bağlı əfsanələrin burada yaygın olması sonralar Homerin m.ö.VIII əsrdə qələmə aldığı eposlarda əks olunmuşdur. Trabzon, Ərzurum, Tokat, Bolu, Tuman yurdları Dədə Qorqud və Koroğlu eposlarının coğrafiyasında batı bölgələrdir. Bu bölgələri keçib gedən protoetrusklarda Koroğlu adının (Kuruqıle, Herekle) və Koroğlu motivlərinin olması normal haldır.

Herodota görə, saqalar Heraklın törəmələridir. Targitayla bağlı saqalardan eşidib yazdığı adların da türk adları olması dolayısı ilə türkləri də Herakl soyuna bağlayır. Etruskların (tirsen) Herakl soyundan törəməsini də Strabon yazmışdır.[100] Beləliklə, Koroğlunun adından tutmuş onunla bağlı motivlər türk-saqa və etrusk əlaqələrinin qədim çağlarına işıq salan önəmli bəlgələrdir.



Etrusk və Saqa daraqları

[100] *Страбон*,V. 2. 2; Yunan mifində Heraklın atlı olmaması göstərir ki, bu mifik surət onlara hələ ata minilməyən m.ö. II minilin ortalarına qədərki çağlarda keçmişdir.

## ETRUSK DİLİNDƏ TÜRK SÖZLƏRİ

Bura qədər söhbət etrusk-türk əlaqələrinə birbaşa və dolayı işıq tutan bəlgələrdən gedirdi, belə bəlgələrdən örnəklər burada da veriləcək. Lakin örnəklərin sayı nə qədər çox olsa da, etruskları bütövlükdə türk toplumu kimi təqdim edə bilmir. Əslində, belə də olmalıdır, çünki etrusk xalqı müxtəlif protoetrusk boylarının Etruriyada qovuşmasından yaranmışdı. Bu durumda qoyun saxlayanlarla yanaşı, donuz saxlayan boylar vardı, qədim türk törələrilə yaşayanlarla yanaşı Taqın yaydığı dini törələrlə yaşayanlar, atacağı hər addımı belə tanrının iradəsinə bağlayanlar və bunlardan da fərqlənən açıq-saçıq, həm də erotik səhnələrdə təsvir olunan yaşamla keçinənlər də vardı. Belə sosial və etnoqrafik fərqlər toplumda formalaşan ortaq dildə də əks olunmalı idi. Görünür, etrusk dilinin leksik tərkibində, qramerində türk dilindən fərqlənən elementlər də bununla bağlıdır.

O çağlarda etrusk dili kimi başqa qarışıq dillərin olmasına dair bəlgələr var. Örnəyin, Herodot qrek (yunan) kökənli sayılan gelonların yarı qrek, yarı skitçə bir dildə danışdıqlarını yazırdı. Müəyən tarixi şəraitdə bir xalqın ikidilli duruma düşməsini göstərən bəlgələr çoxdur. Bilinqvizm adlanan durum dillərdən birinin üstünlüyü, sonra da qələbəsilə nəticələnir. Etrusk dilinin latın dililə əvəzlənməsindən öncəki ikidillilik başdaşı yazılarında geniş əks olunmuşdur. Bu örnəklərdən birinə (TLE 541) baxaq;

Etrusk: **art. Trepi. thanasa**
Latın: **ar. Trebi. histro**

Trebi adının latın variantından aydın olur ki, etrusk yazılarında ***p*** hərfi bəzi sözlərdə [**b**] səsini bildirir. Latın dilində teatrla (tamaşa ilə) bağlı aktyor və aktyorun yaratdığı surət, obraz anlamında işlənən *histrio* sözü etruskcadan alınmadır.

Bu yazıda onun qarşılığı kimi verilən ***tanasa*** sözü surət, şəkil anlamında ola bilər. Bu halda bütöv yazı belə oxunur:

*Arnt Trebi(nin) surəti.*

Əgər semantikası və morfoloji quruluşu ilə diqqəti çəkən *tanasa* sözünün güman etdiyimiz "surət"anlamı doğrudursa, onda etruskcanın bu sözü türkcənin *tanış, taniq* (şahid) sözləri kimi *tanı-* feilindən yaranmışdır. Burada *Turab* adını xatırladan Trebi antroponimi də maraqlıdır. Bu ada başqa bir ikidilli (TLE 462) yazıda *Kay Trebu* şəklində rast gəlirik ki, kayı (qayı) soyunun da saqa-türk qaynaqlarından yuxarıda bəhs olunmuşdu.

Etrusk dilindəki türkcə sözləri, türk dilinə aid qramer göstəricilərini aşkara çıxarmaq yolunda uğur qazanmaq üçün öncə etrusk yazılarının oxunuşunda buraxılan yanlışlıqları düzəltmək lazımdır. Bu üsulun bir-iki örnəyini sınaqdan keçirək:

Athets və Kathn adlı iki döyüşçünün savaşı təsvir olunan bu şəkildə soldakı doyüşçünün dizinə yaxın ***enqen*** sözü yazılmışdır:




Buradan aydın olur ki, etrusk dilində qalib gəlmək anlamında işlənən *engen* feili türkcənin *yengen* (*yeñmək*) sözüdür. Lakin Z. Mayyaninin yanlış transkripsiyasını əsas götürən C. Qaraşarlı *enkten* kimi oxunmuş bu sözün "şaşırmaq, özünü itirmək" anlamında türkcə *engdin* (şaşırdın) olacağını düşünür.[101] Halbuki Mayyani bu sözü yanlış oxusa da, şəkildə Athetsin qalib gəlməsinin təsvir

[101] *Qaraşarlı,* 2005, 102.

olunduğunu, onun dizinə yaxın yazılmış sözün də "qələbə" anlamında olacağını düzgün müəyən etmişdir. Başqa etrusk yazılarının oxunuşunda belə dolaşıq durumlara çox rast gəlmək olur.




Etrusklardan qalma rəsm və kiçik fiqurlar sırasında qrifonlar kimi, qanadlı aslan bədəni olan adam başlı sfinkslər də vardır. Tutacağı sfinks fiqurlu bir bıçağın İtaliyada tapılıb Milli muzeyə verilməsi haqqında məlumatı Leypsik qəzetində (6 fevral 1846) oxuduğunu qeyd edən rus yazarı F.Volanski onu tanrıya qurban verilən heyvanı öldürmək üçün istifadə olunan "qurbanlıq xəncəri" adlandırmış və adam başlı, aslan bədənli, quş qanadlı bu yaratıqdan aşağıdakı yazıda son sözü *Ariman* (Əhriman) şəkliində, başqa bir rus yazarısa *Arsdan* kimi oxumuşdur. Əslində, yazının həmin son sözü fiqurun şəkildə görünən tərəfinə düşdüyü üçün onu oxumaq çətin deyil. Belə ki, bu söz etrusk yazısında **arslan** kimi oxunur.

A. İ. Nemirovski Sardinyanın doğu bölgəsindəki boğazın Artsakena adını *arts//arz* sözü ilə izah edərkən belə yazır: "Etrusk leksikasında "arslan" mənasında *arz, araz* sözkökü geniş işlənir. Dil tərkibi baxımından *Artsakena* toponimi də təmiz etrusk sözüdür. Sardinyada tirrenlərin məskunlaşması izini etruskların hələ antik çağ yazarlarına da bəlli olan *eisar* "tanrı" sözünə dayanan *aisarensas* buradakı *aisar* etnoniminin köküdür." [102]

[102] *Немировский*, 1983, 58.

Yazarın məsələyə baxışı doğrudur, yalnız sözlərin anlamı haqqında dediklərinə düzəliş vermək gərəkir. Belə ki, *araz* "arslan" deyil, boyadıdır, başqa qaynaqlara görə *aisar* (azər) sözü də həm tanrı, həm də boyadı kimi işlənmişdir.

Fil sümüyündən qayırılmış kiçik arslan və ya börü fiquru üzərində añın başından quyruğunacan etrusk əlifbası ilə bu yazı vardır:

**a r a z s i l g e t e n a s s p u r i a n a s**

Yazının əvvəlində "aslan" anlamında *araz* sözünü ayıran etruskoloq M. Pallottino cümləni axıra qədər aça bilməmiş, A. Nemirovski isə azacıq fərqlə həmin oxunuşu təkrarlayıb ilk araz sözünün türk dillərində *arslan* şəklində işləndiyini qeyd etmiş, lakin sonrakı hissələri añ fiquruna aid olmayan *zilx* (titul), *etenas* (titula əlavə) və *spurianas* (xalq) sözlərilə izah etmək istəmişdir. [103]

Hər iki etruskoloqun bu yazıda müəyən etdiyi söz sərhədi düzgün sınırlanmayıb, çünki ꓷ durğu işarəsi bir neçə yerdə *s* səsi kimi sözlərin tərkibində verilmişdir. Etrusk və türk yazı sistemində özünü göstərən orfoqrafik qaydalardan və durğu işarələrindən uyğun bölmədə bilgi verildiyindən onları təkrar etməyə lüzum yoxdur. Həmin qaydaları diqqətə almaqla bu yazını belə transkripsiya edib fərqli oxumaq olur:

**araz silg etenas spurianas** (etruskoloqların oxuması)

**araz** (S) **ilge tenas** (S) **puri anas**. (*Araz elinə tenas Börü-Anan*)

Göründüyü kimi, yazının bu variantda oxunması ortaya çıxan bir neçə dolaşıqlığı aradan götürür: yazının məzmunu kiminsə titulu, vəzifəsilə deyil, Araz (*etrusk*) elində bozqurd (*börü-ana*) kultu ilə bağlıdır və bu kulta sunulan nəsnənin özünə, añ fiquruna aiddir; bu halda, *araz* boyadını yanlış olaraq *arslan* kimi oxumağa da ehtiyac qalmır.

---

[103] *Немировский*, 1983, 95.

Bəzi etrusk yazılarında durğu işarəsi kimi nöqtələr verilməmişdir. Belə yazıların oxunuşunda sözlərin sınırını doğru tapmaq çətindir. Örnəyin, Toskana (Tarquini) adlanan bölgədə m.ö.VII əsrə aid bu yazını etruskoloqlar belə transkripsiya edirlər:

**mivelelthuskakriqunumesiesiputeskraitilesthisputes**

**mi velelthus kakriqu numesiesi putes kraitiles this putes**



Halbuki həmin yazıdakı sözləri düzgün sınırlandıranda ortaya tamam başqa bir fərqli oxunuş ortaya çıxır:

**Mi vel el Tuskak əri Qunume(s) iesi pu te(s). Kara it il eşti(s) pu te(s).**

Etruskologiya elmində yayğın yozumlardan biri budur ki, *tular* sözü etrusk dilinydə "sınır" anlamında işlənir. Bəziləri buna dayanaraq, sözün kökündə (tul) "daş" anlamı olduğunu və onun cəmlik formasının (tul-ar) sınır bildirdiyini düşünürlər. Lakin türk dillərində *dış, dışarı* sözləri və çuvaş türkcəsində onun *tul* forması vardır.[104] Bu baxımdan, türk dillərində iç sözünün antonimi olan dış sözü çuvaş forması ilə etruskcada *tul,* içəri sözünün antonimi olan dışarı sözü də etruskcada *tular* olmalıdır və bu sözün sınır anlamında işlənə bilməsi də semantik çalar baxımından normal haldır.

Göründüyü kimi, etrusk-türk bağı daha çox çuvaş dilinin yardımı ilə çözülür. Bu baxımdan, Lemni yazısı üzərində bir az geniş dayanmaq gərəkir. Etrüskları qədim türklərlə bağlayan başqa bir oxşarlıq hər ikisinin eyni əlifbadan, göytürk runik əlifbasından istifadə etmələridir. Lemni yazısı isə türk runukasına etrusk yazılarına nisbətən bir köynək yaxındır.

[104] *Егоров,* 1964, 256.

## LEMNI YAZISI

Bugün Ege dənizində Yunanıstanla Türkiyə arasında olan Lemni (*Lemnos*) adası vaxtilə Troya sınırına yaxın idi. Antik çağ yazarlarının qeyd etdiyinə görə burada ellinlərdən öncə pelasklar yaşamışlar. Balkanlardan, Yunanıstandan və Anadoludan vaxtaşırı gələn işğalçı orduların hücumlarına uğrayan Lemni qədim Aralıq dənizi ətrafına yayılmış mədəniyət mühitində inkişaf edirdi. Adadan tapılan kiçik yazı örnəkləri burada m.ö. I minilin ortalarına qədər finik və türk əlifbaları ilə eyni mənşəli yazıdan istifadə olunduğunu göstərir.

Adanın güney-doğu Kamini bölgəsindəki kilisə divarında hörgü daşı kimi istifadə olunmuş daşlar arasından 1885-də tapılan "Lemni bəngüdaşı" və onun yaxınlığında üzə çıxan başqa yazılı daş şərti olaraq lemni əlifbası adlandırdığımız yazı növü ilə yazılmışdır. Hazırda m.ö. VII-VI əsrlərə aid edilən bu yazılar Afina Milli muzeyində saxlanır və onların yazılma tarixi adanın yunanlaşmasından öncəyə aid edilir, bu da Lemnosun Afinaya birləşdirildiyi 510-cu ildən öncədir.




Basırıqla bağlı epitafiya xarakterli bu yazılar sağdan sola başlasa da, sətirlərdən bəzilərinin soldan sağa yazılması 2-ci yazıda aydın görünür. Şəkil boyunca yuxarı uzanan üç vertikal sıra sağdan sola, onların arasında yerləşən orta yazıda

beş horizontal sətir isə hər iki istiqamətdə bustrofedon üsulu ilə yazılmşdır. Belə bustrofedon üsulla yazılmış 1-ci yazıda sıralanma həm də ilk sətirlə sonrakı iki sətirin başayaq düşməsinə səbəb olmuşdur:

A



A (1-ci yazının sıra düzümü)



B



I yazı (A)



II yazı (B)



Lemni yazılarının tapılmasından bir əsrdən artıq müddət keçsə də, onun şifrəsi açılmamışdır. Doğrudur, elmi ədəbiyatda Lemni yazısında istifadə olunan əlifbanın etrusk əlifbası ilə eyni olması qənaəti vardır. Bu, bir-iki hərf istisna olmaqla məsələyə düzgün yanaşmadır, lakin bu yanaşmada yazıların oxunma qaydası yanlış yöndədir. Belə ki, etrusk

yazılarının oxunuşunda özünü göstərən qüsurlar, etrusk yazı qaydalarının (imla qaydası) nəzərə alınmaması lemni yazılarının oxunmasında da təkrar olunmuş və hər kəs öz bilik dağarcığı ilə yazıları oxumağa çalışdığından iki-üç sətirlik bu yazının ortaya çıxan oxunuş variantları onu "oxuyanların" sayı qədərdir.[105]

Lemni yazısından bəhs edən yazarlar onun transkripsiyasını fərqli verdikləri kimi, onu müxtəlif dillərdə oxumağa da cəhd etmişlər.[106] Burada həmin oxunuşlardan ətraflı söhbət açmağa imkan yoxdur. Əslində buna heç lüzum da yoxdur. Sadəcə bu fərqləri görmək üçün birinci və ikinci yazını A, B hərflərilə işarə edib vaxtilə onları protolatınca oxumaq istəyən Nikola Densuşianu (1846-1911), sonralar alban dilində oxumağa çalışan Nermin Vlora Falaschi və türk dilində oxumağa səy göstərən Polat Kayanın transkripsiyasına baxmaq kifayətdir:

**(A)** Birinci yazı:

(*N. Densuşianu*) eolai fi focia siale zeronaith e fistho tof eromarom earalio zivai eptezio arai tan foce zivai afiz sialhviz maranm afiz aomaith

(*N. Vlora*) si fai a fes zi arkh fis marakhn a fis a o nai ron haran o si fai epi e zi o ar ai tikh hoke lot ai fsi hoki as i ape zero zai h e fis th h t h fer o na

(*P. Kaya*) hatapasaqss : apatakas ançasape : serata sasata : eqesenç tata : tataqer atana eratam : harapasata : ssaqas : epetesste : **aras** : tas 50? : apatake : ssaqas : aqass : ançasap sçekess : apam kam : aqass : atamas

---

105 Bréal (1886), Bugge (1886), Deek (1886), Pauli (1886 & 1894), Lattes (1894), Torp (1903), Corsten (1930), Friedrich (1932), Nachmanson (1908), Hammarström (1926 & 1928), Kretschmer (1929), Pallottino (1947), Scullard (1967) və başqaları.

106 Friedrich J. Kleinasiatische Sprachdenkmäler. Berlin,1932; Pallottino N. L'origine degli Etruschi. Rome, 1947; Falaschi N.V. L'Etrusco Lingua Viva. - Antichite Civilità Mediterranee, II. Rome, 1989; Kaya P. www.compmore.net/~tntr/lemstelec.html; Scullard H. H. The Etruscan Cities and Rome. Thames & Hudson. 1967; Bonfante L. Etruscan. Berkeley and Los Angeles, 1990.(University of California Press). ISBN 0-520-07118-2; Steinbauer, Dieter H. Neues Handbuch des Etruskischen. St. Katharinen: Scripta Mercaturae Verlag, 1999.

**(B)** İkinci yazı:

(*N. Densuşianu*) eolai na foth ziazi maraz mav sialhveiz afiz e fistho zeronaith zivai famala sial zeronai morin ail a cer taf arzio

(*N.Vlora*) zi a zi maraz maf zi arkh feis a fis e fis th h zer o nai th si fai aker taf ar zi th fama pa zi ar zer o nai mori na ip hopaie zi math h th

(*P. Kaya*) hatapase :s: anaapatata **aker**: takarsste **qam** . **apa** . ançasap : serata anasamata eresenasap ançasass : qam :s. apam : ançasap sçekess.s : aqas : seqssençtata serata anasata ssaqas

Göründüyü kimi, hər üç oxunuş variantında transkripsiya ilə yanaşı, sətirlərin ardıcıllığı və sözlərin sırası da fərqlidir. Son vaxtlar daha çox yayılıb qəbul edilən və etrusk dilinə aid dərsliklərdə yer alan transkripsiya isə belə verilir. (Sətirləri asan oxunmaq üçün sözlər soldan sağa sıralanmışdır):



**A)** hopa svss : f oks assa pe : sero nash : evss ho : tove roma ssvas : avss : ssa px vss : **mara** kn : avss : **atmas** rom : harapso : ssvas : ep tesso : **aras** tss : f oke



**B)** hopase : s : navthth : ssass : **mara** . s : mav : ssa px ves . s : avs : evssth : sero nas th : ssvas : **aker** : tavarssth : van : **apa** . ssap : sero nas morsnas p

Doğrudur, burada sıralanma düzgün müəyən edilmiş və qara hərflə verdiyimiz *apa, mara, aker, atmas, aras* sözlərinin transkripsiyası doğru verilmişdir, lakin bütün əvvəlki variantlarda olduğu kimi yazıların buradakı oxunuşu da ger-

çək durumu əks etdirmir, çünki sözlərin sınırını bəlirləyən durğu işarəsi (Z) səs kimi sözün tərkibində verilmşdir. Bu qədər fərqli oxunuşları ortaya çıxaran araşdırıcıların əksəri sanki müxtəlif mətnlər üzərində işləmişlər.[107]

Hər iki yazıda işlənən hərflər əsasında tərtib olunan lemni əlifbası etrusk əlifbasındakı hərflərlə eynidir, yalnız etrusk yazılarında *kh* [x], *i* səslərini bildirən hərflər burada göytürk yazılarında olduğu kimi *ç, s/ş* səslərini bildirir:




Göründüyü kimi, lemni yazısı etrusk və göytürk yazıları arasında olan bir əlifba ilə, həm də etrusk-göytürk yazılarında zəif görünən, lakin lemni yazılarında daha qabarıq olan orfoqrafiya (imla) qaydası ilə yazılmışdır. Belə ki, burada söz və söz birləşmələri birdən üçə qədər nöqtələrlə və Z işarəsilə ayrılmış, hətta bir neçə yerdə bu işarə iki tərəfdən nöqtələrlə **⁝ Z ⁝** şəklində yazılmışdır. Lakin yuxarıda verilən nümunələr göstərir ki, lemni yazılarını oxumaq istəyənlər bu durğu işarəsini yanlış olaraq sözün bir hissəsi kimi z//s səsilə oxuyurlar, ona görə də etruskologiyada hələ də davam edən həmin metod yazıların şifrəsini açmağa mane olur.[108] Belə yazılarda yalnız *a, e* saitlərinin verilməsi yazıda qeyd olunmayan başqa saitlərin bərpa olunmasını ortaya çıxardır. Deyilənləri nəzərə alanda lemni yazılarının tranckripsiyası, fonetik oxunuşu belə olur:

---

[107] Son vaxtlar lemni yazılarını belə transkripsiya edənlər də var: **A)** hulaieš : naφuθ : šiaši maraš : mav sialχveiš : aviš evisθu : šerunaiθ šivai aker : tavaršiu vanalasial : šerunai : murinail; **B.** hulaieši : φukiasiale : šerunaiθ : evisθu : tuveruna rum : haraliu : šivai : eptešiu : arai : tiš : φuke šivai : aviš : sialχviš : marašm : aviš : aumai.

[108] *Azər xalqı,* 2005, 190.

**A)** xthpase Z: phthksa Z sape : Z erthna sd : egs Z dth : tthgerthma Z sgas : ags Z : Z sapçgs Z : mara qm: ags Z athmas rthm : xarapsth : Z sgas : elte Z sth aras : 1 41 : phthke .

*xətpaşe pitiksa sape eratma sd egis dut tetig eratıma sugas agıs sapçı ges mara qam agıs atmas ertim harapustu sugas elte şat aras il 41 bitke*

**B)** xthpase :Z: napthd :Z sap : mara Z: mag Z sapçges Z: ags Z: egs Z dth :Z er athna sd . Z sgas aker : tagar . Z sth . qam. apa Z sap : Z erthna smthrsnasp .

*xətpaşe na pitid sap mara mag sapçı ges ags egis dut er atına şat suqas aker tagar şat qam-apa sap ertna smtrsnasp*

Adətən dili məlum olmayan yazıların şifrəsini açmaq üçün etimoloji ya da kombinator metoddan istifadə olunur. Lemni yazılarını oxuya bilmək üçün hər iki metodu sınaqdan keçirməyin yararı vardır. Bunun üçün kombinator üsulla bir neçə sözün semantikasını müəyən edəndən sonra etimoloji yozuma keçmək gərəkir.

Yazılarda boy və şəxs adları kimi bəzi onomastik sözlər (*sqas, sape, aras, qam-apa, aker, tagar*) diqqəti çəkir. Belə ki, *sqas* sözü hər iki yazıda keçir, hələlik bu sözün çuvaş boyadının qədim *sugas* forması [sugaş//şugaş] olacağını ehtimal etmək olar. Çünki çuvaş dilində sugaş > çuvaş fonetik dəyişməsində baş verən g//ğ > v, s//ş> ç səsdəyişmələrinin bənzəri *bağır* (baqır) > *pĕver* və *baş//bas* > *puç* kimi başqa çuvaş sözlərində özünü göstərir. Əslində etrusk orfoqrafiyasına görə *sgas* sözü *svas* kimi oxunur. Bu yozum yazıdakı *suqas aker* (çuvaş Aker), *sugas ags* (çuvaş ağzı), *sugas elte* (Çuvaş elində) deyimlərinə aydınlıq gətirir və buradakı *ags* (ağız) sözünün semantikası aydınlaşır.

Hər iki yazıda bir neçə dəfə işlənən *ags* sözünü *avs, aviš, afiz, aqas, αFıζ* şəklində oxuyub ona müxtəlif mənalar ver-

mişlər. Kombinator metodla bu sözün "dil" anlamına uyğun gəldiyini görmək olur: *suqas ags* "suqas dili", *ags atmas* "dildən düşməz". Etimoloji metod da *ags* şəklində yazılan leksemin *ağız* sözü olduğunu ortaya qoyur. Bu yazılarda dil, nitq, danışıq mənasına uyğun gələn *agıs* (ağız) sözü bugün də Anadoluda "dialekt" anlamında işlənir.

Birinci yazıda *ağızatmaz* deyimindən sonra yazılmış *rthm* sözü qədim türk yazılarında işlənən "idi" köməkçi feilinin *ertim* formasıdır: *ağızatmaz ertim* "dildən düşməz idim".

Hələlik yazılı daş üzərində şəkili çəkilmiş adamın adının Aker Tagar olduğunu düşünmək olar. Qazaxların soykökü mifində arqın, nayman, kerey, qıpçaq, konqrat boylarının soybabası sayılan *Akares Kazak* oğlu bu adla uyuşan bir ad daşıyır.[109] Məşhur Çanaqqala savaşında 27-ci alay komutanı Yarbay Şefik də *Aker* adı ilə tanınırdı. Etrusk (Toskana) elindən danışan antik çağ yazarı *Ager* adını çəkir.[110] Göründüyü kimi, lemni yazısında keçən Aker adı etrusk və türk şəxs-adları üçün yad deyildir.

Etruskların özlərinə *rasen* (əslində, *aras-en*) deməsi 1-ci yazıda etrusk anlamında olan *aras* sözündə əks olunmuşdur: *xarapustı suqas eltə şat aras*. Yazıdan aydın olur ki, *aras* boyundan bu ərdəmli, cəsur (*sat//şad*) döyüşçü o çağlarda yerini müəyən edə bilmədiyim Suqas (Suvas) elindən imiş. Suqas elinin "qaradumanlı" təyini isə *xarapustı* sözüdür.[111]

---

[109] Kazakların soy, damğa ve uranları. Kazak genel tarihi. Urumçi, 1987 (TDA, sayı 118, 1999, 229); Türk dillərində itlə qurdun qarışığı olan ov iti *aker* adlanırdı. Bu baxımdan, Aker Taqar adının ikinci tərəfi (Taqar) tarixi şəxslər olan kuman bəyləri İtlər, Bonyak (Bənək) ilə adı yanaşı çəkilən Tuqarkanın adı ilə (Tuqar-kan) müqayisə oluna bilər.

[110] *Varro*. Lingua Latina. V, IX.

[111] Qarabağlı dostum Ovçu Səfərov kəndlərində "çən-çiskin" anlamında *püsəngi* sözünün işləndiyini söyləmişdi. Homer yazıların tapıldığı Lemnos adasının özünü "dumanlı", "limansız" epitetlərilə verir (*İl.* XXIV, 753).

Qədim türk yazılarında "kitab" və "yazı" anlamında olan *bitik* sözünün kökündə duran *bit-* (bitmək) feili epitafiyalarda geniş işlənir. Vaxtilə aramey dilinə keçən *petqa* sözü o dildə "abidə" anlamında işlənirdi. Bəngüdaş yazıları çox vaxt *bitdi, bitidim* (bitirdim) sözlərilə yekunlaşır. Lemni (A) yazısı da *bitke* sözü ilə bitir. Etrusk dilində III şəxsin təkini bildirən *-ke* şəkilçisilə işlənmiş *pitke* sözü lemni yazısında "bitdi" anlamındadır. Etrusk yazılarında da *biti* sözü görünür. "Latına Tin (tanrının) yazısı" anlamında belə epitafiya vardır: **(TC 338)** LATINA : PITI TINAL (*Latın-a biti Tin-al*).

Lemni yazsında *bitke* sözündən başqa, bir də *pitiksa sape* deyimi keçir. Buradakı sape sözünün hansı anlamı daşıması onun pitiklə yanaşı işlənməsi ilə aydınlaşır. Bunu yoxlamaq üçün başqa sözlərə də baxmaq olar. Sevmək sözünün qədim *səb* forması, birləşdirib-bağlamaq mənasında *səp* sözü, sıra, sıralama anlamında *sap* sözü vardı. Antik çağda Lemnosda Trakiya kökənli boyların *sape* adlanması qeyd olunmuşdur.

Azər türkcəsində sinonim qoşa söz kimi *söz-sav* deyimi vardır. Qədim "Irk Bitik" əsərində söz, dua anlamında *sab,* xəbər gətirən, sözçü anlamında *sabçı* sözləri işlənir. Lemni yazısnda *sap, sape, sapçı, sp* formasında yazılmış sözlərin kombinator metodla yozumunu vermək üçün onların hansı sözlərlə yanaşı işlənməsinə baxmaq gərəkir: *pitiksa sape; sapçı ges; qam-apa sap; sna sp.* Bu son deyimdə *suna* sözü ilə işlənən *sp* da "söz" anlamı daşıya bilər və ya çuvaşca *sănă sıp* (süngü sapı) deyimi kimi süngüdə tutaçaq hissəyə (sap) aid ola bilər, lakin 2-ci yazının bu son sözlərinin transkripsiyasında bir problem var. Belə ki, (Z) *erthna* sözündən sonra gələn və hələlik *smthrsnasp* şək-



lində transkripsiya olunan hissədə sual işarəsilə verdiyimiz hərflər əlimizdə olan fotokopidə *s* deyil, biri *th,* digəri *l* işarəsi kimi görünür. Bu halda, 2-ci yazının həmin hissəsi *thmthrsn alp* kimi transkripsiya edilir və bəngüdaş üzərindəki yazını yazdıranın *Tursun Alp* adı ortaya çıxır. Lakin bu versiya türk epitafiyası gələnəkləri baxımından cəlbedici görünsə də, onun nə dərəcədə düzgün olması son iki hərfin döğru oxunmasından asılıdır. Bu nədənlə həmin sonluğa hələlik yazılışı dəqiqləşdirilənə qədər yozum vermirik.



(Z) erathna thm thrsn alp
....... adım Tursun Alp

Hər iki yazının müqayisəsi göstərir ki, onları eyni adam yazmamışdır, çünki bəzən həm eyni sözün yazılışında, həm də eyni sözlərin sıralanmasında fərq görünür. Belə ki, hər iki yazı eyni sözlə (*xthpase*) başlanır, lakin 1-ci yazıda bu sözün son hərfi və sınır işarəsi aydın yazılmayıb, ançaq o biri yazılışla onu bərpa etmək olur. Daş üzərində cızılan işarələrdə belə hallarla çox qarşılaşırıq.




Yazıların bu ilk sözünü *hulaieš, hatapase, eolai, hopase* və başqa şəkillərdə oxumuşlar. Lemni yazısında çuvaş dilinin qabarıq görüntüləri *xthpase* sözünün çuvaşca *xăt* (qut) və *puç* (baş) sözlərindən ibarət olub, qutlu başlıq anlamında işləndiyini düşünmək olardı. Lakin yazıların başında gələn bu sözün tərkibində sami dillərdən alınma *xətt* sözü olacağı da istisna deyil və bütöv sözün *xətbaşı* deyimi olması mətnə daha uyğundur. Çünki xətt sözü "yazı" anamında işlənmişdir. Firdofsinin "Şahnamə" əsərinin Bombey əlyazmasında yabqu (türk) boyunun əlifbası anlamında *xətte yabğu* deyimi keçir. Bu baxımdan, Lemni yazılarının *xətbaşı* sözü ilə başlanmasında bu sözün yönəltici rolu ortalıqdadır.

Lemni yazılarının birində *mara qam,* digərində *mara maq* deyimində mar//maq//qam sözlərinin üçü də "kahin" anlamı ilə Ön Asiyada işlənən sinonim sözlərdir. Azərbaycanda maq boylarından çıxan *maqlar* və türk xalqlarında olan *qamlar* bəllidir. Arameycə də din xadiminə *mar* deyilirdi. Dədə Qorqut qəhrəmanları başqa dindən olanlara *mərə kafir* deyimilə müraciət edir, bəzən bu deyimlə özləri də bir-birinə sataşırdılar. Görünür, lemni yazılarını daşa yazan sabçı kahin imiş, çünki sabçıya *mara qam//mara maq* deyə xitab olunur. 2-ci yazıda Qam-Apa deyimi də var. Aker bəyə şad titulu onun adından, onun sözü ilə (*Qam-Apa sabı*) verilməsi göstərir ki, *qam-apa* deyimi Suqas elində başqam və ulu xaqana aiddir.

Qədim türklər ada böyük önəm verirdilər, ərdəmli igidlər şanlı-şöhrətli ad qazanmaq üçün savaşlarda inadla vuruşur, aldığı adla qürur duyurdu. Qədim türk yazılarında "*ər adı*" deyimi çox işlənir. Örnəyin, Barık (Yenisey) yazısında keçən *"er erdəmi atım tabtım"* (ərdəmli ər adımı tapdım) deyimi lemni yazısında bir neçə dəfə təkrar olunan "*er atım*" və "*titig er atım*" (anlaqlı ər adım) ilə eyni ovqatı sərgiləyir.

A və B yazılarında söz düzümü fərqlənir və bu, yazıların müxtəlif sabçı tərəfindən yazılmasını ortaya qoyur, hər iki yazıda eyni anlamlı 12 sözün sıralanması bunu açıq-aydın göstərir: A) *sape er adıma şad egiz dut .... sugas agız sapçı ges mara qam...* B) *sap mara maq sapçı ges agız egiz dut er adına şad sugas ....*

| | |
|---|---|
| A) ... **sapçı ges** *mara qam* | A) ... **er adıma şad** egiz dut |
| B) ... *mara maq* **sapçı ges** | B) ... egiz dut **er adına şad** |

Lemni yazılarının mətni göstərir ki, hər iki yazıda Aker Tagarın bəngüdaşı (başdaşı) üzərinə yazılası epitafiyada ər adına şad titulunun ekiz tutulması (əlavə olunması) vurğulanır. Birinci yazı I şəxsin (ölənin) adından, ikinci şəkilli yazı

isə Qam-Apanın sözü kimi III şəxsin adından (Tursun Alp?) yazılmışdır. Görünür, Aker Tagar öləndə əvvəlcə onun adından birinci yazı adi daşa, ikinci yazı isə sonra düzəldilmiş bəngüdaşa yazılmış, həm də bunları müxtəlif sabçılar (sözçülər) yazmışlar. Lemni yazılarının dili göytürk yazılarının dilinə, üslubu qədim türk epitafiyalarına, əlifbası türk runuk əlifbasına yaxınlığı ilə diqqəti çəkir. Hər iki yazıda *mar* və *xətt* sözündən başqa, sözlərin hamısı qədim türk sözləridir. Tam oxunan 1-ci yazının məzmununu müasir dilimizə belə çevirmək olar:

Xəttin başı: *Sıralayıb yaz ər adıma şad, ekiz tut anlamlı ər adıma, suqas dililə sözçü kəs (kişi). Mərə qam, dildən düşməzdim qaradumanlı Suqas eldə. Şad araz, 41 il. Bitdi.*

Beləliklə, lemni yazılarının "dili açıldı", ancaq dili açılan bu yazılar ortaya Aker Tagar şadın kimliyi, yazının hansı türk boyuna aid olması kimi bir neçə yeni sual çıxartdı. Bu sualların cavabı həm də yazının yazılma tarixinə uyğun tarixi olaylarla uzlaşmalıdır.

Herodot yunanlardan öncə Lemnos adasında pelaskların (Πελασγοι), Fukidid isə tirsenlərin (Τυρσενοι) yaşadığını yazmışdır. O çağın yunan yazılarında *tirsen* və *etrusk* adı sinonim işlənirdi. Görünür, "dəniz xalqları" sırasında hər iki boyun (*plst, trs*) adı keçdiyi üçün pelasklarla tirsenlər eyni boylar olmasa da, onların qohum boylar olması quşqu doğurmur. Lemni yazısı bunlardan birinə aid ola bilər.

Tövratda Yafəsoğulları sırasında qamər (kimmer) və *trs* (tiras) qardaş sayılır.[112] Təbəri də türk-xəzər boylarının *tiras* (tireş) soyundan törədiyini yazır.[113] Başqa bir ehtimala görə, lemni yazısı qamər boylarının Anadoluda m.ö.7-ci əsrin ortalarında apardığı savaşlarla bağlı ola bilər. Çünki 8-ci əsrin

---

[112] *Təkvin*, 10-11.
[113] *Təbəri*, I. 272.

sonlarından Kiçik Asiyaya gələn qamərlər burada bir neçə bölgəni ələ keçirmiş, 674-də Friqiya dövlətini dağıtmış, 20 il sonra Lidiya çarını öldürmüşdülər. Həmin ildə (654) Asur çarı Aşşurbanipala aid yazıda qamər elbəyi Tuğdamenin oğlu Sandak Şat haqqında belə deyilir: "Mən Tugdammenin qüvvəsini dağıdacağam, meydanda onu əvəz edən, onun belindən gələn oğlu Sandakşatru əzəcəyəm". [114]

Bilindiyi kimi, qədim türk törəsinə görə elbəyin, xaqanın oğulları (teginlər) qoşun və ya bölgə başçısı təyin olunanda onun ər adına *şad* ünvanı (titulu) əlavə edilirdi. Asur çarının yazısında belə bir elbəy oğlu olan *Sandak-şat ərin* adı keçir. Lemni yazılarında da Aker Tagarın ər adına *şad* titulu əlavə edilməsindən bəhs olunur. Bu baxımdan, lemni yazılarını qamər boyu ilə bağlayıb, Aker Tagar şadı qamər elbəylərindən birinin oğlu saymaq olar, çünki hər iki yazıda onun ər adına şad titulunun əlavə olunması qeyd edilir. Görünür, 41 yaşında Lemni adasında savaşda ölən bu elbəy oğluna şad ünvanı həmin savaş günlərində verilmişdi. Ona görə, hər iki yazıda *mara qam* (*mara maq*) deyimilə müraciət olunan sabçıdan *ər adıma şad ekiz tut* (*ekiz tut ər adına şad* ) sözlərinin suqas dilində yazılması tələb olunur.

Lemni yazısının yazılma tarixi Aker Tagar şad üçün son döyüş olan savaşın tarixilə bağlıdır. Hər halda, Lemnos adasında bu savaş qamər hegemonluğunun ilkin çağlarında deyil, son çağlarında baş vermişdir. Lidiya çarı Aliata yenilən qamərlər 7-ci əsrin sonunda Anadolunun doğu bölgələrinə çəkildilər. Görünür, Aker Tagarın son savaşı təxminən 620-610 arasında olmuşdur.

Beləliklə, qədim türk tarixinə yeni bəlgə verən lemni yazıları Suqas elinin, suqas (çuvaş) dilinin və Aker Tagarın mənsub olduğu araz boyunun da qamərlərlə bağlı olmasını

---

[114] *Дьяконов,* 1956, 285.

ortaya qoyur. Bu yozum qamər-etrusk əlaqələrinə işıq tutur, etrusk dilinin türk qatında çuvaş dilinə məxsus elementlərin varlığına, özlərini rasen (*aras-en) adlandıran etrusk toplumunda qamər kökənli araz boyunun önəmli çəkisinə aydınlıq gətirir.

*

* * *

Lemni yazısı üzərində verilən yorumlar bir daha etruskların Anadoludan İtaliyaya getdiyini yazan Herodotun haqlı olduğunu göstərir. Lemni yazısı göytürk və etrusk runikası arasında yer tutur və daha çox etrusk yazılarına yaxınlığı ilə diqqəti çəkir.

Lemni yazısındakı türk sözləri etruskcadakı türkizmlərdən daha anlaqlıdır. Belə ki, burada işlənən *bitik, sab, sabçı, el, il, ər ad, ağız, qam, apa, tetik, tut, şad* kimi turk sözləri çox aydın oxunur. Lakin qarışıq (hibrid) etrusk dilində olan sözlərin içindən türkizmlərin seçilməsi hələlik müəyən çətinliklərlə bağlıdır, mövcud olan yanlış baxışların, yazılara yanlış orfoqrafik yorumlarla yanaşmanın nəticəsində bir sıra maneələr yaranmışdır. Deyilən problemi gözardı etmədən, etrusk yazılarında olan daha bir neçə söz, titul və şəxsadının leksik anlamlarına baxaq.

Kiçik Asiyanın qədim dillərindən bəhs edən V.V. Şevoroşkin kari adlarının sonunda görünən *alp* sözünün burada işlənmiş *Alpos* adı ilə bağlantısını mümkün sayır və müqayisə üçün etruskcadan *cul-alp* sözünü sual işarəsilə örnək göstərir.[115] Əlbəttə, *alp* sözünün "igid" anlamı onun türk adlarına qoşulmasına imkan vermişdir və etruskların tale tanrısı kimi kimi təqdim olunan ***Kul-alp*** adında türkcə "şanlı igid" anlamı vardır. Bu baxımdan, uzmanların ***Alpan*** teonimini cəsarətli tanrıca kimi deyil, onun adında *həvəslə, istəklə* (willingly)

---

[115] *Шеворошкин*, 1965, 232.

sözlərini axtarması əbəsdir. Bir etrusk yazısının sonluğunda *alpan turke* (alpan sunağı) sözləri işlənir ki, burada da *alpan* igid, cəsur anlamındadır.

Doğu türklərdə Ulgen tanrının epitetlərindən biri də ***Ayaz*** adıdır. A. İnan qeyd edir ki, bəzi şaman dualarında Ulgenə *aqayaz* (ağ ayaz), *ayazkan* deyimlərilə müraciət olunurdu.[116] Etrusk yazılarında bahadır adı kimi keçən Ayvaz yunanların Ayaks (Ayaz) adı ilə qarşılaşdırılır. Hər halda, ***Eyvaz*** variantı da qeyd olunan bu adların Koroğıu-Herekle əlaqələri fonunda etimoloji baxımdan araşdırılması yararlı ola bilər.

Tit Liviy "*Ab urbe Condito*" adlı kitabında maraqlı bir qızqaçırma olayından bəhs edir. Roma şəhəri inşa ediləndən sonra burada qızların qıtlığı üzündən qonşu bölgədən bayram şənliyinə gələn qızlarla evlənmək üçün gənc oğlanların hər biri gözaltı etdiyi qızı qaçırır. Gözəl bir qızı qoltuğuna alıb aradan çıxmağa tələsən bir dəliqanlıdan nə etdiyini soruşanda təngənəfəs cavab verir ki, *talassiya, talassiya*. Bu olayı təkrar qələmə alan Plutarx da yazır ki, o çağdan toy şənliklərində "Talassiy! Talassiy!" deyimi alqış kimi işlənir, lakin heç kim onun mənasını bilmir.[117]

Bu deyimin Anadoludan gətirilməsi quşqusuzdur, çünki eyni alqış het yazılarında var. Dini törəyə görə, het çarı öz xanımı ilə qutsal izdivac ritualı yerinə getmək üçün arabaya minib saraydan çıxanda arxalarından kütlə "Talisa!" alqışı ilə onları yola salırdı. Lakin həmin alqış sözünün anlamını hetlər də bilmirdi. A. İ. Nemirovskiyə görə, het dilinə bu söz hat və ya hurri dilindən keçə bilərdi.[118] Əgər bu söz *tələs* feilidirsə, onda het çağında Anadoludakı urmu, kuman, subar, qaşqay və sair türk boylarından birinin dilindən alınmışdır.

---

[116] *İnan*, 1972, 32.

[117] *Тит Ливий*, 1989, (I. II. 1; I. I.VII.1; I. IX, 12); *Плутарх*, II, 1963, 336.

[118] *Немировский*, 1983, 225.

Etrusk yazılarında işlənən ***lukumon*** titulu baş kahin və hökmdar sanı bildirir, yəni etrusk toplumunda lukumon həm *başqam*, həm *başqan* sayılırdı. Etrusk inancına görə yeraltı qüvvələrlə təmas qurma bacarığı olan lukumonlar qutsal sayılırdı. Romalı yazar Festə görə, lukumon hara yanaşırdısa, ora təhlükəli məkana çevrilirdi. Yunanların *basilevs* dediyi lukumonların yaşamı o qədər rituallaşmışdı ki, onlar dini törələrin quluna çevrilirdi. Sözün anlamını açmaq üçün onun hansı məna çalarları olmasına baxmaq lazım gəlir. Lukumon sanına bu kontekst daxilində baxanda onun ulu-qam anlamı ilə işlənən *ulukam* (ulukam-an) sözü olduğunu görmək olur.

**Tiberi** (Roma carı). C. Qaraşarlı bu adı *tiber* türk boyadı ilə bağlayır.[119] Belə yozum mümkündür, lakin qədim türk el (dövlət) qurumunda "vali" anlamında *təbər, eltəbər* titul bildirən söz olduğundan Tiberi adının yozumu bu yöndə daha uğurlu ola bilər.

**Dursun**. Appian m.ö.V əsrdən sonrakı keltlərlə romalıların savaşlarından bəhs edərkən Romada tanınmış Fabiy soylu bir qamın adını *Qay Fabiy Dorson*, Tit Liviy isə onun adını *Qay Fabiy Dorsuon* kimi verir.[120] Azər türklərində və başqa türk xalqlarında *Dursun, Tursun* adı geniş işlənir.

**Tin** (Tinia). İtaliya dilçisi prof. Mario Alineyi etruskların baş tanrısı Tinia ilə türklərin Tengri teonimi arasındakı əlaqəni qeyd edib bunlarda eyni söz kökü olduğunu yazır.[121]

Etrusk dilindəki türkizmlərdən danışarkən vaxtilə etrusklardan latın dilinə keçmiş sözləri də nəzərə almaq lazımdır. Latin dilindəki *pedis* (bit), *urbis, orbis* (uram, ordu, şəhər, dairə), *sero* (sarımaq), *balte* (beldə, kəmər), *curia* (kurum), *curulis* (dövlət taxtı), *veto* (bitmək), *konsilium* (konuşma,

---

[119] *Qaraşarlı*, 2005, 68.

[120] *Аппиан*, 2004, 237.

[121] *Alinei*, 2005.

gənəşmə), *camillus* (kam, gənc rahib) və bu kimi onlarla sözün etrusk dilindən qalması mümkündür. Beləliklə, *tirsen* adı ilə tarix səhnəsinə çıxan, özlərinə *araz* deyən etruskların və etrusklarla birbaşa əlaqəsi olan, lakin onların içində alt qatda o qədər də qabarıq görünməyən *urum, qayı, subar, qamər* boylarının dilindən etrusk yazılarında qalan türk sözlərinin bir hissəsini belə sıralamaq olar.

| **etrusk** | **türk dilləri** | **azər** | **ingilis** |
|---|---|---|---|
| **alpan** [alpan] | **alpan** | *alpan, igid* | *brave* |
| **an** (III şəxs) | **an** | *an, o,* (III şəxs) | *he, she* |
| **apa** [apa] | **apa, aba** | *əbə* (dialekt) | *father* |
| **arslan** [arslan] | **arslan** | *aslan* | *lion* |
| **ath** [ath] | **at, ad** | *ad* | *name* |
| **avil** [awil] | **yıl** | *il* | *year* |
| **axrum** [axrum] | **aqrı**(ma) | *ağrıma, xəstəilk* | *affliction* |
| **camthi** [kamthi] | **kende** | (titul) | *magistrate* |
| **capra** [kapra] | **kap** | *qab* | *urn* |
| **cap** [kap] | **kap** | *qab* | *container* |
| **cela** [kela] | **kil** (çuvaş) | *-gil, ailə, otaq* | *room* |
| **cupe** [kupe] | **küp** | *küpə, cam* | *cup* |
| **clan** [oklan] | **oklan** | *oğlan* | *son* |
| **clenar** [oklenar] | **oklanlar** | *oğlanlar* | *son`s* |
| **lucair** [*ulukayr] | **ulukər** | *ulu(q) ər* | *to rule* |
| **lucumo** [*ulukumo] | **ulukam** | *ulu qam* | *king* |
| **lupu** [olupu] | **ölüp** | *ölüb* | *died* |
| **macte** [makte] | **makta** | *öygü* | *praise* |
| **mlac** [mulak] | **belek, büllək** | *ərmağan, hədiyə* | *offering* |
| **mi** [mi] | **men, (me-n)** | *mən* | *me* |
| **nac** [nak] | **neke** | *necə, niyə* | *how* |
| **nene** [nene] | **nene** | *nənə, dayə* | *nurse* |
| **paqathur** [paxathur] | ***baqa-tura** | *baxıcılıq* | *augury* |
| **papa** [papa] | **baba** | *baba* | *grandfather* |
| **puia** [puya] | **bayan** | *bəyim, qadın* | *wife* |
| **pla** [pila] | **pilĕk** (çuvaş) | *beş* | *five* |
| **pr** [pir] | **pĕr** (çuvaş) | *bir* | *one* |
| **purth** [purte] | **purte** (çuvaş) | *balta* | *axe* |

| | | | |
|---|---|---|---|
| **rath** [erath] | **erat** | *ər ad, özəl ad* | *name* |
| **ril** [eril] | **eril** | *ər il, yaş* | *aged* |
| **sacni** [sakni] | **sak, sakın** | *saxlanc, qoruq* | *sanctuary* |
| **suth** [suth] | **süt, süd** | *süd* | *milk, sheep?* |
| **suc** [suk] | **çuk, çük** (çuvaş) | (qurban törəni) | *ritual akt* |
| **sval** [sagal] | **sağal** | *sağ olmaq* | *alive* |
| **tana** [tana] | **tanı** | *tanımaq* | *to recognize* |
| **tam** [tam] | **tam** | *dam* | *house* |
| **thap** [thap] | **tap** | *tapınmaq* | *to find* |
| **tarchon** [tarxon] | **tarkan** (titul) | *tarxan* | *ruler, lord* |
| **tiberi** [tiberi] | **təbər** (titul) | *təbər, eltəbər* | *ruler* |
| **tul** [tul] | **tul** (çuvaş), **tış** | *dış* | *out, stone?* |
| **tular** [tular] | **tışarı** (l~ş) | *dışarı, sınır* | *border* |
| **uke** [uke] | **oku** | *oxumaq* | *to read* |
| **une** [une] | **an**(ta) | *onda, o vaxt* | *then* |
| **vel** [vel] | **văl** (çuvaş) | *o, ol* (III şəxs) | *he, she* |
| **zila** [zila] | **yula** (başqord) | (titul) | *magistrate* |

Roma şəhərində yeni qol (*Yanikul*) və yuxarı (*Yugarius vicus*) məhəllələri, qədim subar boyadı ilə *Subura* adlanan etrusk kvartalı vardır. Bu türk adları sanki Romanın simgəsi sayılan Bozqurdun ünvanını göstərən keçmiş tarixin yaddaşı kimi qalmaqdadır. Bizə düşən bu yaddaşı oyatmaq, yeniləməkdir.

Oxuyub bitirdiyiniz bu bitik hələ bitmədi. Elmi üslubdan uzaq və bəlgələrin imkan daxilində sadə dillə oxuculara sunulmasında əsas amac bugün dostumuz olan İtalya xalqının soykökündə özəl yeri olan etruskları tanıtmaq idi. Bu bitiyin davamını illərlə toplanmış bəlgələrin, etrusk yazılarının yeni oxunuşu ilə artıq ciddi elmi yorumlarla Ulu Tanrının bağışladığı yaşam sürəcində ortaya çıxarmaqdır.

ƏDƏBİYAT

*Alinei M.* Etrusco. Una forma arcaica di ungherese. Bologna, 2003

*Alinei M.* Addenta Etrusco-Turco-Ugrici. 9 L`etimologia altaica del teonimo etr. Tinia: turcico Täng-ri dio del cielo. "Quaderni di Semantica", 51, 2 (2005)

*Alont G. L.* Renderings of Four Etruskan İnscriptions. 2003

*Ayda A.* Les Etrusques étaient des Turcs. Preuves. Ankara, 1985

*Ayda A.* Türklerin ilk ataları.Ankara, 1987

*Ayda A.* Etrüskler (Tursakalar) Türk idiler. Ankara, 1992

*Achilli A.* Mitochondrial DNA variation of modern Tuscans supports the near Eastern origin of Etruscans. "American Journal of Human Genetics" 80, 2007

*Ağasıoğlu F. (Cəlilov).* Azərbaycan dilinin morfonologiyası. Bakı, 1988

*Ağasıoğlu F.* Azər xalqı. B. 2005

*Ağasıoğlu F.* Qədim türk elləri. Saqa-qamər boyları. B. 2006

*Ağasıoğlu F.* 2500 il öncə Qarabağda toxunmuş Bərdə (saqa-oğuz) xalısı. "Füyuzat" dərgisi. №1, (39), 2008

*Ağasıoğlu F.* Tanrı elçisi İbrahim. B. 2009

*Betham W.* Etruria celtica. I-II, Dublin, 1842

*Bloch R.* The Origins of Rome. N.Y. 1960

*Bloch R.* Le origini di Roma. II Saggiatore, Milano, 1963

*Bonfante G.* and Bonfante L. The Etruscan language. N.Y., London, 1983.

*Bonfante G., Bonfante L.* The Etruscan Language: an Introduction. University of Manchester Press, 2002, ISBN 0-7190-5540-7

*Bonfante L.* Etruskan. London, British Museum Publication. 1990

*Brandenstein W.* Die Herkunft der Etrusker. Lpz. 1937

*Buffa M.* Nova raccolta di iscrizioni etrusche. Firenze,1935

*De Vaux B. C.* La langue etrusque. Champion, Paris, 1911

*Donuk A.* Eski türk devletlerinde idari-askeri ünvan ve terimler. İstanbul, 1988

*Eberhard W.* Çinin şımal komşuları. Ankara, 1942

*Ellis R.*. The Armenian origin of the Etruscans. London, 1861

*Əskər R.* Qutadğu bilig. B. 2003

*İnan A.* Tarihte ve bugün Şamanizm. Ankara, 1972

*Facchetti G. M.* L'enigma svelato della Lingua Etrusca. Roma, 2000

*Feher G.* Bulqar türkleri tarihi. Ankara, 1984

*Ferri S.* Opuscula. Firenze. 1962

*Həsənov H.Ə.* Türkşünaslığın bəzi problemləri. «Azərbaycan» jur. №8, 2002

*Carlo De S.* Tirreni a Lemnos. Evidenza linguistica e tradizioni storiche. Firenze, 1996

*Corssen W.* Über die Sprache der Etrusker. Lpz., I-II, 1874-1875

*Gostony, C.-G.* Dictionnarie d'étymologie sumérienne. Paris 1975

*Qaraşarlı C.* Qədim yunan, roman, kelt və german dillərində türkizmlər. B. 2005

*Kaya P.* Reading of the etruscan Pirgi tablets."TDA", sayı 119, 1999

*Kaya P.* Etruscan-turkish connection chapter II. The etruscan orator inscription. "TDA", sayı 118, 1999

*Kuzgun Ş.* Hazar ve karay türkleri. II baskı, Ankara, 1993

*Livia K. Sz.* Az etruszkok nyomában. Korvino Kiadó, 1977, İSBN 977

*Ligeti L.* Bilinmeyen İç Asya. Ankara, 1986

*Mirşan K.* Bugünkü Avrupa dillerinde etruskca izleri. (1-5) Bodrum, 1996

*Mirşan K.* Proto-Türkce yazıtlar. MMB, Ankara, 1970

*Oğuz Y.* Qədim Anadolu və Azərbaycan türkləri. Bakı, 2002

*Pallottino M.* The Etruscans. Penguin Books, 1956

*Pallottino M.* Etruscologia. Milano, 1968 a

*Pallottino M.* Testimonia linguae etruscae. Firenze, 1968

*Pallottino M.* The Etruscans. Indiana University Press, 1975

*Pittau M.* Testi Etruschi tradotti e commentati - con vocabolario. Roma, 1990

*Pittau M.* La Lingua Etrusca - Grammatica e Lessico. Nùoro, 1997

*Pittau M.* Lessico Etrusco-Latino comparato col Nuragico, Sassari, 1984

*Pfiffig A. J.* Die etruskische Sprache. Verl.-Anst., 1969

*Rix H.* Etruskische Texte. 1991, İSBN 3-8233-4240-1 (2 Bde.)

*Sagitov M. M.* Başkurt folklorunda hayvanlara tapınma. "TDAY, 1986 (1982-1983)"

*Scullard H. H.* The Etruscan Cities and Rome. Thames & Hudson, 1967

*Tarcan H.* Öntürk uyqarlığı. İstanbul, 2001

*Trombetti A.* Ancora sulla parentela dela lingua etrusca. Roma, 1934

*Thomopulos J.* Pelasgica. Athenes, 1912

*Thomsen V.* Remarques sur la parenté de la lanque étrusque. "Bulletin de l`Akademie Royale des Sciences et des Lettres de Danemark." Kopenhagen, 1899

*Vəliyev V.* Folklorşünaslığın bəzi məsələləri. "BDU-nun Elmi əsərləri", №6, 1979

*Zəkiyev M Z.* Törki-tatar etnogenezı. Kazan-Möskӧy, 1998

*Аппиан.* Римская история. С.-Пб. 2004.

*Арутюнян Н. В.* Биайнили (Урарту). Ереван, 1970

*Блок Р.* Этруски. Предсказатели будущего. М. 2004

*Буриан Я., Моухова Б.* Загадочные этруски. М. 1970

*Вергилий* (*Публий Вергилий Марон*). Буколики. Гиоргики. Энеида. М. 1971

*Гейбуллаев Г.* К этногенезу азербайджанцев. Б. 1991

*Гиндин Л.А., Цымбурский В.Л.* О Езеровской надписи и фрако-этрусских связах: Проблемы мнимые и подлинные. М.1987

*Гордезиани Р. В.* Этрусский и картвельский. Тб. 1980 (на груз. яз.)

*Егоров В. Г.* Этимологический словарь чувашского языка. Чебоксары, 1964

*Иванов В. В.* К истолкованию этрусских текстов на основе сравнительного языкознания. // Текст: семантика и структура. М. 1983

*Иванов В. В.* Древневосточные связи этрусского языка. //Древний Восток: этнокультурные связи. М. 1988

*Каррыев В. А.* Эпические сказания о Кёр-оглы у тюркоязычных народов.М. 1968

*Кляшторный С. Г.* Руническая эпиграфика Южной Сибири. «СТ», №4, 1976

*Короглы Х. Г.* Взаимосвязи эпоса народовв Средней Азии, Ирана и Азербайджана. М. 1983

*Кызласов Л.Р.* Городская цивилизация Срединной и Северной Азии. М. 2006

*Латыпов Ф.* Элементы морфонологии этрусского языка в свете пратюркской гипотезы. «АФМ», III, 1991

*Латыпов Ф.Р.* Исследование древних языков Средиземноморья на основе фоно-эволюционной гипотезы и комбинаторно-частотных методов. Уфа, 2003

*Латыпов Ф. Р.* Этрусская надпись BU 899 на каменном вкладыше придорожного обелиска: призыв к уважению и порядку. Вест. ОГУ, 11, 2004

*Ливий Т.* Истороя Рима от основания города. М. 1989

*Чубова А. П.* Этрусское искусство. М. 1972

*Майяни З.* Этруски начинают говорить. М. 1966

*Маловичко А. В.* Этрусский язык - один из восточнокавказских? // Мови та Культури Заходу й Кавказу. Киjв, 2000.

*Маловичко А.* Где была прародина этрусков? "Лит. Грузия", № 1-6. Тб., 2001.

*Маловичко А. В.* Опыт интерпретации памятников этрусской письменности. Сучасне укра jнськe кавказознавство. Киjв, IУКС, 1999.

*Мельникова Е. А.* Древнескандинавские географические сочинение. М. 1986

*Младшая Эдда.* Л. 1970

*Немировский А.И., Харсекин А.И.* Этруски. Введение в этрускологию. Воронеж, 1969

*Немировский А. И.* Этруски: от мифа к истории. М. 1983

*Плетнева С.А.* Половцы. М. 1990

*Раевский Д. С.* Модель мира скифской культуры. М. 1985

*Робер Ж.-Н.* Этруски. М. 2007

*Савинов Д. Г.* Изображения собак на оленных камнях. «Скифо-сибирское культурно-историческое единство», Кемерово, 1980

*Соссюр Ф. де.* Труды по языкознанию. М.1977

*Симокатта Ф.* История. Москва, 1957

*Страбон.* География в 17 книгах. М.1994

*Шеворошкин В. В.* Этимологические заметки. "Этимология", 1965

*Чертков А. Д.* Пеласго-Фракийские племена, населявшие Италию. М. 1853

*Чертков А. Д.* О языке пеласгов. М. 1853 а

*Харсекин А. И.* Вопросы интерпретации памятников этрусской письменности. Ставрополь. 1963.

*Эббот Дж.* Ромул. Основатель вечнего города. М. 2004

*Эллен М.* Этруски. Быт, религия, культура. М. 2006

QISALTMALAR

*AFM* - Azərbaycan fililogiya məsələləri. Bakı, "Elm" nəşriyatı

*AİOSK* - Antiçnıe istoçniki o Severnom Kavkaze. Nalçik, 1990 (rusca)

*Azər xalqı* - *Ağasıoğlu F.* Azər xalqı. "Çaşıoğlu" nəş. 2000; "Ağrıdağ" nəş. 2000; "Çıraq" nəş. B. 2005

*ƏƏR* - Əsatirlər, əfsanələr və rəvayətlər. (Tərtib: *Acalov A., Bəydili C.*), B. 2005

*9 Bitik* - *Ağasıoğlu F.* Azərbaycan türklərinin İslamaqədər tarixi. I-IX, (əlyazma)

*CIE* - Corpus İnscriptionum Etruscarum (Leipzig, etc. 1893)

*KDQ* - Kitabi Dədə Qorqut. Bakı, 1988

*TDA* - Türk Dünyası Araştırmaları. İstanbul

*TDAY* - Türk dili araşdırmaları yıllığı - Belleten. Ankara.

*TLE* - *Pallottino M.* Testimonia Linguae Etruscae. Firenze. 1954; (II basqı) 1968

*ThLE* - Thesaurus Linguae Etruscae, I Indice lessicale. Roma,1978; I Supplemento, 1984; Ordinamento inverso dei lemmi, 1985; II Supplemento, 1991

*ДА* - Древняя Анатолия. М.1985.

*ИДВ* - История Древнего Востока. М.

*ИДВ II* - История Древнего Востока. Часть II. (Передняя Азия). М.1988

*ИДМ* - История Древнего мира. I-III т. М.1982-1983

*ИЭДР* - Искусство этрусков и Древнего Рима. М. 1982

*МНМ* - Мифы народов мира. Энциклопедия. Том 2, М. 1992

*СДО* - Семантика древних образов. Новосибирск, 1990

*Этнос* - Этнос в доклассовом и раннеклассовом обществе. М.1982

Yazar kitabın işıq üzü görməsinə yardım edən
**"Oğuz Eli"** İctimai Birliyinin sədri
**Hüseyn Abdullayevə**
təşəkkür edir

